**Azərbaycan Milli Elmlər Akademiyası**
**Nəsimi adına Dilçilik İnstitutu**

---

**İLHAM TAHİROV**

# TEMPORAL LEKSİKA

*(Azərbaycan və ingilis dillərinin materialları üzrə)*

Bakı - 2008
«Nurlan»

*Azərbaycan Milli Elmlər Akademiyası Nəsimi adına Dilçilik İnstitutu Elmi Şurasının qərarı ilə nəşr olunur*

**Elmi məsləhətçi**
**və redaktor:** **akad. Ağamusa AXUNDOV**

**Rəyçilər:** **İsmayıl Məmmədov**
*Filologiya elmləri doktoru*

**Sayalı Sadıqova**
*Filologiya elmləri doktoru*

**Fikrət Cahangirov**
*Filologiya elmləri doktoru*

**İlham Tahirov. Temporal leksika** (Azərbaycan və ingilis dillərinin materialları üzrə). **Bakı, Nurlan, 2008/ - 142 səh.**

Monoqrafiyada zaman anlayışını ifadə edən leksik vahidlər Azərbaycan və ingilis dillərinin materialları əsasında araşdırılmış, onların semantik strukturu öyrənilmiş, felin zaman formaları ilə əlaqəsi əsas götürülərək semantik cəhətdən təsnifatı verilmiş və kommunikasiya prosesindəki semantik funksiyaları müəyyənləşdirilmişdir.

$\frac{4602000000}{N-098-2008}$ ***Qrifli nəşr***

## Ön söz əvəzi

Obyektiv gerçəkliyin əsas xassələrindən biri olan zaman məkanla bərabər insanın həyatında mühüm rol oynayır. İnsan özünün praktik fəaliyyətinin bütün sahələrində zaman amili ilə üzləşir. Bu səbəbdən zaman kateqoriyası, onun mahiyyəti, zamanın dildə ifadə üsulları və vasitələri ilə bağlı məsələlər zaman-zaman müxtəlif elm sahələrini təmsil edən tədqiqatçıların, o cümlədən dilçilərin diqqətini cəlb etmişdir.

Ümumi dilçilik ədəbiyyatında zaman münasibətlərinin dildə inikas və ifadəsi məsələlərinə həsr olunmuş çoxlu əsərlər vardır. Bu əsərlərdə obyektiv zaman kateqoriyasının dildə müxtəlif və rəngarəng ifadə vasitələri fərqləndirilmişdir: 1) morfoloji vasitələr (felin zaman formaları); 2) sintaktik vasitələr (zaman budaq cümləsi, xüsusi zaman bağlayıcıları, təktərkibli bəzi cümlə tipləri və s.); 3) leksik vasitələr (zaman anlayışlı və ya temporal isimlər, sifətlər, zərflər, sabit birləşmələr); 4) leksik-qrammatik vasitələr (temporal isimlərin müəyyən sözönülərlə və ya hal şəkilçiləri ilə işlənən formaları, eləcə də temporal isimlərin sifət və əvəzliklərlə birlikdə əmələ gətirdikləri sərbəst söz birləşmələri).

Dilçilik ədəbiyyatında zaman münasibətlərinin bütün ifadə vasitələrinə diqqət yetirilsə də, ən çox morfoloji vasitələr müfəssəl şəkildə tədqiqat obyekti olmuşdur. Azərbaycan dili üzrə dərslik, dərs vəsaiti və qrammatika kitablarından əlavə, zaman münasibətlərinin fel formaları ilə ifadəsinə həsr edilmiş xeyli miqdarda xüsusi monoqrafiya, dissertasiya və məqalələr vardır. Bu araşdırmaların əksəriyyətində zaman münasibətlərinin dildə morfoloji ifadə vasitələri, yəni fel formaları ilə ifadə xüsusiyyətləri müfəssəl,

amma zamanın digər ifadə vasitələrində təcrid olunmuş şəkildə tədqiq edilmişdir. Bəllidir ki, bütün digər dil vahidləri kimi, zamanın dildə ifadəsini reallaşdıran vasitələr də kommunikasiya prosesində, nitqdə bir-birinə müəyyən təsir etməklə qarşılıqlı surətdə fəaliyyət göstərir. Dilçilikdə son vaxtlarda dil vahidlərinin öyrənilməsinə yeni yanaşma zaman münasibətlərinin ifadə vasitələrini qarşılıqlı fəaliyyət kontekstində təhlil etmək üçün yeni imkanlar açır. Müxtəlifsəviyyəli dil vahidlərinin daşıdığı semantik funksiyaların ümumi və oxşar olması müddəasına əsaslanaraq, həmin ifadə vasitələrinin qarşılıqlı əlaqə və münasibətlərini nəzərdən keçirmək olar və bu, vacib məsələlərdən biridir.

Azərbaycan dilində zaman münasibətlərinin leksik ifadə vasitələri bu baxımdan tədqiqata cəlb edilməmişdir. Zaman münasibətlərinin leksik ifadə vasitələrinin, yəni temporal leksikanın felin zaman formaları ilə qarşılıqlı əlaqəsinin bir çox mühüm məsələləri bizim dilçiliyimizdə hələ də təfsilatlı tədqiqini tapmamışdır. Bu yönümdə aparılacaq tədqiqatlar, şübhəsiz, Azərbaycan dilçiliyində funksional-semantik istiqamətin inkişafına kömək edəcək. Azərbaycan dilində temporal leksikanın qeyd edilən istiqamətdə araşdırılması və başqa dillərin, xüsusilə ingilis dilinin materiallarını cəlb etmək yolu ilə bu növ araşdırma sahəsinin genişləndirilməsi gerçəkliyin zaman münasibətlərinin bəşəri dildə ifadə edilməsi qanunauyğunluqlarının bir sıra nəzəri, eləcə də dillərin öyrədilməsi metodikasının optimallaşdırılmasına kömək edəcək praktiki məsələlərinin həlli üçün imkanlar açır.

# GİRİŞ

İnsanın onu əhatə edən ətraf aləm haqqında biliklər əldə etmək, ətraf aləmin hansı elementlərdən təşkil olunduğunu və həmin elementlərin bir-biri ilə nə cür əlaqə və münasibətdə olduğunu dərk etmək, buradan əldə etdiyi bilikləri özündə saxlamaq, qazandığı müxtəlif növ bilikləri cəmiyyətin digər üzvlərinə, nəticə etibarilə sonrakı nəsillərə ötürmək arzusu və istəyi tamamilə təbiidir. Həmin təbii arzu müxtəlif növ biliklərin əldə edilməsi, qorunması və ötürülməsi üçün vasitələrin meydana çıxmasına gətirib çıxarmışdır. Bir sıra səbəblərdən insanların birgə fəaliyyətini təşkil etməyə, bilikləri qorumağa və ötürməyə imkan verən universal vasitə məhz dil oldu. Bu özünəməxsus sistem qeyri-adi çevikliyi sayəsində içindəki müəyyən vahidləri özündən xaric və özünə daxil etməklə, onların forma və məzmununu dəyişdirməklə, onların tətbiq sahəsini daraldıb-genişləndirməklə ən müxtəlif ehtiyaclar üçün uyğunlaşmağa qabildir. İnsanın fəaliyyət sahəsinin genişlənməsi, insan idrakının inkişafı yolu insanın öz fəaliyyətini gerçəkləşdirməsi üçün istifadə etdiyi dil vahidlərində və onların xarakterində inikas edir. Dili onun vahidlərinin nomenklaturasını, onun cəmiyyətdəki funksiyalarını təyin etmək yolu ilə öyrənmək, dil vahidlərinin təfəkkür vahidləri ilə əlaqəsini araşdırmaq bəşər övladına dünyanın sirlərinə vaqif olmağın hansı yollarla baş verdiyi və bu prosesdə dilin hansı rolu oynadığı barədə dolaysı yolla mühakimələr irəli sürməyə imkan vermişdir. Məhz belə yanaşma nəticəsində dilin meydana gəlməsi üçün obyektiv ilkin şərtləri müəyyənləşdirməklə bağlı bir sıra nəzəri və təcrübi məsələlərin cavablandırılmasına, mədəniyyətin digər elementləri arasında dilin möv-

qeyinin üzə çıxarılmasına kömək etmişdir. Məhz belə yanaşma nəticəsində müəyyən edilmişdir ki, dil cəmiyyətin mövcudluğunun zəruru şərtidir. Müəyyən edilmişdir ki, dil cəmiyyətin yaddaş saxlancı və əvvəlki nəsillərin təcrübəsinin sonrakılara ötürülmə vasitəsidir. "İnsan – dil – cəmiyyət" cərgəsində "dil"in qeyri-adi mövqe tutması belə bir faktla səciyyələndirilir ki, dil kökləri etibarilə insanın psixikasının dərinliklərinə işləsə də, yalnız cəmiyyətdə meydana gələrək fəaliyyət göstərə bilər. Dilə sahib insanın mövcud olduğu, yaşadığı ətraf aləmin ayrılmaz komponentlərindən biri Zaman hesab olunur.

Zaman və insan ta qədimdən fəlsəfi problemlər sahəsinə aid olan mövzulardan olmuşdur. Bununla belə, zamanla bağlı olan və üzərində filosofların işlədiyi faktiki material ilkin olaraq müxtəlif elm sahələri çərçivəsində işlənib sistemləşdirilir ki, onların arasında fizika, astronomiya, arxeologiya, tarix, fiziologiya, psixologiya, iqtisadiyyat, sosiologiya və s. mühüm yer tutur[1]. Obyektiv gerçəkliyin təfəkkür vasitəsilə proyeksiyalandığı dil ilə bağlı elmin – dilçiliyin bu planda xüsusi yeri

---

[1] Bu barədə daha ətraflı bax: Мостепаненко А.М. Проблемы универсальности основных свойств пространства и времени, Л., Наука, 1969; Reichenbach H. The Direction of Time. Berkeley and Los Angeles,1956; Whitrow C.J. The Natural Philosophy of Time. London and Edinburgh, 1961; Тураева З.Я. Категория времени. Время грамматическое и время художественное (на материале англ. языка), М., «Высшая школа», 1979; Ахундов М.Д. Пространство и время в физическом познании. М.: Мысль, 1982; Головаха Е.И., Кроник А.А. Понятие психологического времени // Категории материалистической диалектики в психологии. - М.: Наука, 1988, стр. 199-215; Урманцев Ю.А., Трусов Ю.П. О свойствах времени // Вопросы философии, 1961, 5, 58-70; Яковлев В.П. Социальное время. Ростов-на-Дону: Изд РГУ, 1980.; Хасанов И. А. Феномен времени. Часть 1. Объективное время - М.: 1998.

və xüsusi rolu vardır. Bu elm vasitəsilə dünyanın müxtəlif dillərində müxtəlif cür adlansa da, Azərbaycan dilindəki “zaman” anlamı ilə birbaşa və dolayısı ilə əlaqələnən vahidlər öyrənilir. Dilçilik ədəbiyyatında geçəkliyin zaman münasibətləri ilə əlaqəli olan dil vahidləri müxtəlif səvəyyələrdə və müstəvilərdə izah edilir. Məsələn, zamanı adlandıran, onu təmsil etməyə, işarələməyə, onunla assosiasiya yaratmağa qabil olan vahidlər araşdırılır. Bu halda zamanın bir obyekt, anlayış və anlayışla əlaqəli dil vahidi kimi mövcud olması faktı aşkar, ya da üstüörtülü şəkildə qəbul edilir. Yəni son nəticədə zaman, yaxud temporal mənalı vahidlərdən söhbət gedir.

Obyektiv gerçəklikdə zaman və insan arasında münasibətlərin nəticələrini ifadə edən dil vahidləri zaman və ya temporal məna, anlam və anlayış sahəsini təmsil edir. Bununla məşğul olan tədqiqatçılar diqqəti zaman anlayışının və ya kateqoriyasının ifadə üsullarına yönəldərək temporal münasibətlərin ifadə üsulları, bu münasibətlərin linqvistik ifadə imkanları, yaxud zaman münasibətlərinin tipologiyası kimi məsələlərə müraciət edirlər. Temporal məna, anlam və anlayışların movcud olması faktı morfoloji səviyyədə zaman, yəni felin zamanı ilə birlikdə, leksik, sintaktik və hətta mətn səviyyəsində zaman, eləcə də bədii zaman, zaman sahəsi, temporallıq sahəsi, zamanın leksik göstəriciləri, temporal genişləndiricilər, leksik dəqiqləşdiricilər, indikatorlar və s. kimi termin və anlayışların dilçilik ədəbiyyatında dövriyyəyə daxil olmasına rəvac verdi. Zaman və ya temporal tematika üzrə terminologiya çoxşaxəli olmaqla bərabər, həmin terminologiyanın şərhində aydın olmayan və ya qarışıq məsələlər barədə danışmaq da mümkündür ki, bu barədə az sonra danışılacaqdır.

Söylədiklərimizdən belə qənaətə gəlmək olar ki, gerçəkliyin zaman strukturunun dildə insanın tərəfindən mənimsənilməsində iştirak edən morfoloji, leksik və sintaktik vahidlərin mütəşəkkil sistemi vardır. Bu dil vahidləri tərkibinə görə müxtəlif olub həm məzmun, həm də funksional planda təzahür edir.

Məzmun planında müxtəlif dillərdə dilin ayrı-ayrı səviyyələri üçün temporal mənası aşkar olan vahidlər fərqləndirilə bilər. Morfoloji səviyyədə belə vahidləri xüsusi zaman morfemləri, leksik səviyyədə zaman anlayışlı sözlər və ya temporal leksika, sintaktik səviyyədə sintaktik konstruksiyalar təmsil edir. Funksional planda müxtəlif dillərdə zaman məzmununun ifadə usulları baxımından ixtisaslaşmış dil vahidləri vardır.

Yuxarıda xatırlanan dil vahidləri arasında zaman mənalı sözlər və ya temporal leksika xüsusi mövqeyə sahibdir.

Temporal leksikaya mənasında zaman anlayışı olan sözlər sözlər daxildir. Onları temporal sözlər də adlandırırlar. Bir çox müəlliflərin fikrinə görə, zaman mənalı sözlərdə gerşəkliyin zaman münasibətlərinin bir-birini əvəzetmə ardıcıllığı ilə bağlı olan təbii proseslər üzərindəki müşahidələr öz təsbitini tapır. Zaman proseslərinin uzunluğunu ölçmək zərurəti zamanın ölçülməsi vasitələrinin meydana gəlməsinə gətirib çıxardı ki, bu da zamanın ölçü vahidlərini bildirən müvafiq qrup sözlərin üzə çıxması ilə nəticələndi. "İnsanın zaman daxilində özünün mövcudluğunu dərk etməsi onun yaş dövrlərinin adlarını bildirən sözlərin (məs., *uşaqlıq*, *gənclik*, *yeniyetməlik* və s.), eləcə də özünün tarixini, onun ayrı-ayrı

dövrlərini (məs., *keçmiş, indi, gələcək, əbədiyyət, əsr* və s.) əks etdirən sözlərin meydana gəlməsinə gətirib çıxardı”[1].

Zamana münasibətdə dil vahidlərinin kompleks təhlili, onların formalaşması mexanizminin nəzərdən keçirilməsi geniş faktik materialın, eləcə də artıq mövcud olan tədqiqatların nəticələrinin sərf-nəzər edilməsini tələb edir.

## A. Temporal leksikanın tədqiqinə dair

Hər bir tədqiqat işinə verilən mühüm tələblərdən biri də əvvəllər əldə edilmiş nəticələrə bələd olmaq və onlardan səmərəli istifadə etməkdir. Bu baxımdan temporal leksikanın öyrənilməsinin müasir vəziyyətinə diqqət yetirilməsi müəyyən əhəmiyyət kəsb edir. Buna görə də temporal leksikanın araşdırıldığı tədqiqatlara nəzər salmaq lazım gəlir. Müxtəlif dövrlərdə, xüsusən də XX yüzilliyin ikinci yarısından başlayaraq bir çox dilçilər müxtəlif dillərdə temporal mənalı sözləri tədqiqata cəlb etmişlər. Temporal leksikanın sistemli şəkildə öyrənildiyi rus və ingilis dillərini bu cəhətdən xüsusi qeyd etmək lazımdır. Temporal leksika həmin dillərin, eləcə də başqa dillərin materialları əsasında və ya müqayisəli şəkildə həm sinxron, həm də diaxron planda öyrənilmişdir.

Bu və ya digər səpkidə aparılan tədqiqat işlərində əsasən ayrılıqda götürülmüş bir dilin materialları tədqiq edilir[2] və

---

[1] Потаенко Н.А. Время в языке, Пятигорск: ПГЛУ, 1996, с. 24.

[2] Всеволодова М.В. Способы выражения временных отношений в современном русском языке. М., 1975; Каращук В.А. Темпоральные прилагательные в современном русском языке. Автореф. дисс. ... канд. филол. наук. Ташкент, 1978; Клименко А.П. Существительные со значением времени в русском языке, Автореф. дисс. ... канд. филол. наук. Минск,

ya iki, yaxud daha çox dilin müqayisəli, tipoloji təhlili verilir[1].

Bu tədqiqatlar biri-birindən araşdırılan materialın həcminə görə də seçilir. Onlarda tədqiqat spektri ayrıca temporal leksemin, kök-sözün təhlilindən tutmuş[2], leksik-semantik və leksik-qrammatik sistemə qədər genişlənir[3].

Bu sahədə aparılmış bir sıra işlərdə zaman kateqoriyasının ekstralinqvistik və linqvistik reallıqları, zaman anlayışları və onların dildə ifadəsinin nisbəti kimi məsələlər təhlil olunur, zamana tarixi, kulturoloji hadisə olaraq yanaşılır. Belə tədqiqatlar artıq dar linqvistik çərçivədən çıxır, fəlsəfə, kultu-

---

1965; Морковкин В.В. Опыт идеографического описания лексики (Анализ слов со значением времени в русском языке). М., 1977; Рудометкина М. И. Слова категории времени (на материале английского языка), Автореф. дисс. ... канд. филол. наук, Киев, 1972; Василенко О.В. Функционирование наречий времени современного английского языка в текстах различных стилей. Автореф. дисс. ... канд. филол. наук. Киев, 1998; Атаева А. Лексические средства выражения времени в туркменском языке. Автореф. дисс. ... канд. филол. наук, Ашгабат, 1993.

[1] Волянская И.В. Лексико-семантические особенности существительных, обозначающих единицы измерения времени в английском и русском языках. Автореф. дисс. ... канд. филол. наук. М., 1973; Аскарова А.Х. Семантические процессы в рамках лексико-семантического макрополя времени (на материале русского, английского и немецкого языков). Автореф. дисс. ... канд. филол. наук. Саратов, 1992.

[2] Балясникова Л.А. Лексико-семантическое развитие слов с этимологическим корнем *доб-* (из истории корнеслова русского языка). Автореф. дисс. ... канд. филол. наук. Л., 1974.

[3] Шепин А.Г. Лексико-грамматичесое поле времени в современном русском языке (Время в поэтической речи), Иркутск, 1974; Щербин В.К. Общее и специфическое в лексико-семантических системах близкородсвенных языков (На материалах русской и белорусской пространственной и временной лексики). Автореф. дисс. ... канд. филол. наук. Минск, 1983.

rologiya, psixologiya və dilçilik kimi elm sahələrinin qovşağında baş verən hadisələri araşdırır[1].

Yuxarıda haqqənda söhbət açdığımız tədqiqat işləri arasında temporal mənalı sözləri əhataetmə baxımından V.V.Morkovkinin rus dilində zaman mənalı leksikanın ideoqrafik təsvirinə həsr olunmuş tədqiqatı xüsusi seçilir. Müəllif sözlərin əlifba sırası ilə deyil, məna yaxınlığına görə yerləşdirildiyi ideoqrafik lüğətlərin yaradılması üçün temporal leksikanı zaman mənalarının aşkarlanması məqsədilə araşdırır. Rus dilinin izahlı lüğətlərindən toplanmış və tərkibində *zaman* («время») sözünün və onun ideoqrafik sinonimlərinin olduğu leksik vahidlərin lüğət definisiyalarının təhlili əsasında konkret leksik-semantik söz qruplarına xas olan əsas zaman mənalarını aşkarlayan müəllif həmin mənaları semantik cəhətdən eynicinsli qruplara bölür. Müəllif bu bölgü əsasında təqdim olunan zaman mənalarının siyahısında ümumi mənaların ardıcıl parçalanması (xırdalanması) nəticəsində xüsusi mənaları üzə çıxarır. Tədqiqatda leksik zaman sahəsi nisbi və qeyri-nisbi zaman olmaqla ikişaxəli semantik ağac şəklində təsəvvür edilir. Burada hər bir qrupa daxil edilmiş zaman anlayışlı sözlər 23 əlamət üzrə təsnif edilir[2].

Rus dilində temporal isimlərin, sifətlərin və zərflərin ifadə etdiyi zaman mənalarının müfəssəl və dərin təhlili

---

1 Караулов Ю.Н. Языковое время и языковое пространство // Вестник МГУ. М., 1970, № 1, с.61-73; Маковский М.М. «Картина мира» и миры образов (Лингвокультурологические этюды) // Вопросы языкознания, М., 1992, № 6, с.36-53; Юрченко В.С. Реальное время и структура языка // Вопросы языкознания, М., 1993, № 3, с.36-47

2 Морковкин В.В. Опыт идеографического описания лексики (Анализ слов со значением времени в русском языке). М., 1977 с. 86-92

T.A.Lisitsina tərəfindən verilmişdir. Tədqiqatçı qeyd edilən temporal leksikanın semantik təsnifatı üçün nitq momenti ilə əlaqənin (nisbətin) olub-olmadığı əlamətini götürür. Bu əlamətə əsasən bütün temporal leksika iki böyük leksik-semantik qrupu bölünür: 1) nisbi zaman mənalı leksika; 2) qeyri-nisbi zaman mənalı leksika. Birinci qrup üçün əsas əlamət nitq momenti ilə əlaqənin olması, ikinci qrup üçün əsas əlamət nitq momenti ilə əlaqənin olmamasıdır. Hər bir qrup mikroqruplara ayrılır və onların ümumi və fərqli cəhətləri aşkarlanır. Dəqiq müəyyənləşdirilmiş semantik meyarlara əsaslanan və bütün temporal leksikanı əhatə edərək təqdim edən bu təsnifatı rus dilinin temporal leksikasının təsnif edilməsində uğurlu addım saymaq olar[1] .

Temporal leksikanın təhlilində A.X.Askarovanın tətbiq etdiyi yanaşma tərzi də maraq doğurur. İngilis, rus və alman dillərinin materialları üzrə leksik-semantik zaman makrosahəsindəki semantik prosesləri izləyən tədqiqatçı zamanın obyektiv rəngarəngliyinin əks olunmasında müxtəlif səviyyəli mücərrədləşmə prinsipindən çıxış edərək birlikdə leksik-semantik zaman makrosahəsini əmələ gətirən beş müstəqil heterogen leksik-semantik sahə (LSS) fərqləndirir: LSS I «təbii şəraitin hissi qavranılan konkret sikllləri» (təbiət zamanı); LSS II «insanın həyat vəziyyətinin siklləri» (insan zamanı); LSS III «zamanın konkret ölçülməsi» (sosial zaman); LSS IV «ümu-

[1] Лисицина Т.А. Лексика с временным значением в современном русском языке (существительные, прилагательные, наречия) – В кн. Исследования по семантике. Вып. 2. Уфа, 1976, с. 12-26.

mi(ləşdirilmiş) zaman» («обобщенное время»); LSS V «rel-yativ zaman»[1].

Həmin əsərdə zaman kateqoriyasının dərin konseptual təhlili verilmişdir. LSS-dəki semantik proseslər orada sinxron və diaxron planda nəzərdən keçirilir. Bunlarla bərabər, müəllifin bəzi müddəaları ilə razılaşmaq çətindir. Məsələn, tədqiqatçıya görə, LSS I və LSS II temporallıq makrosahəsinin nüvəsini təşkil edir, digər LSS-lər isə onlarla növ münasibətində qalır: “Makrosahənin nüvəsi denotativ oriyentasiyalı sahələrdir: LSS I ...(təbiət zamanı) və LSS II ... (insan zamanı). Zamanın kəmiyyət aspekti və zamanın mücərrəd dərk olunması ilə bağlı olan sahələr LSS I və LSS II əsasında meydana çıxmışdır və onlarla növ münasibətindədir...”[2]. Genetik baxımdan bu mülahizənin doğruluğuna şübhə edilmir. Lakin müasir semantik sahə nəzəriyyəsinə görə, sahənin nüvəsini ən mücərrəd leksemlər təşkil edir. Bu mücərrəd mənalı leksemlər daha konkret mənalı digər vahidlərin müvafiq sahəyə aid edilib-edilməməsində identifikator rolunu oynayır. Azərbaycan və ingilis dillərində leksik temporallıq sahəsinin modelini qurarkən, sahənin nüvəsini təşkil edən elementləri üzə çıxararkən məhz bu prinsipə əsaslanmışıq[3].

Temporal leksikanın (isimlərin, sifətlərin, zərflərin) ifadə etdiyi zaman mənalarının təfsilatlı diferensiasiyasına

---

[1] Аскарова А.Х. Семантические процессы в рамках лексико-семантического макрополя времени (на материале русского, английского и немецкого языков). Автореф. дисс. ... канд. филол. наук. Саратов, 1992, с. 9-14.

[2] Yenə orada, s. 9.

[3] Bax: İlham Tahirov. Azərbaycan və ingilis dillərində zaman kateqoriyası. Bakı, Nurlan, 2007, s. 114-125.

həsr olunmuş tədqiqatlardan biri M.Rudometkinaya məxsusdur. O, tədqiqatını ingilis dilinin materialları üzrə aparmışdır. Mənasında zaman anlayışı olan sözləri tədqiqatçı semantik baxımdan *lokalizatorlar*, *korrelyatorlar* və *modifikatorlar* adı altında üç qrupa ayırır və hər bir qrupu yarımqruplara bölür. Məsələn, *lokalizatorlar* qrupu *zaman ölçüləri* və *triada* (üçlük) yarımqruplarına ayırılır; *korrelyatorlar* qrupunda *öncəgəlmə*, *eynizamanlılıq*, *sonragəlmə* və *aralıq* nisbətli yarımqruplar fərqləndirilir; *modifikatorlar* qrupunda *uzunluq*, *təkrarlıq* və (*son*) *hədd* bildirən yarımqruplar özünə yer almışdır[1].

İngilis dilində temporal leksikanın leksik-semantik sahə şəklində araşdırıldığı tədqiqat işlərindən birində temporal leksik vahidlər dominant semantik əlamət əsasında iki cərgəyə bölünür. Bunlardan birincisinə mənasında zaman kəsiyi (müddət), zaman anı və sonsuzluq olan sözlər daxil edilir və onlar xətti (mənalı) vahidlər cərgəsi adlandırılır. İkincisinə zaman münasibəti ifadə edən sözlər daxil edilir və əlaqələndirmə mənalı vahidlər cərgəsi olaraq qəbul edilir. Tədqiqatda göstərilir ki, xətti vahidlərin əksəriyyəti dildə daha qədim zaman leksikasını təmsil edir və dilin əsas lüğət fonduna daxil olur. Məhz bu cərgənin vahidlərinin öyrənilməsi hər konkret bir dildə perseptual zamanın təşəkkülünü və inkişafını izləməyə imkan verir[2].

---

[1] Рудометкина М. И. Слова категории времени (на материале английского языка). Автореф. дисс. ... канд. филол. наук. Киев, 1972.

[2] Жалейко Р.А. Перцептуальное время и его выражение в функционально-семантическом поле темпоральности (на материале англ. языка). Автореф. дисс. ... канд. филол. наук. М., 1980.

Müasir ingilis dilində müxtəlif üslublu mətnlərdə zaman zərflərinin funksionallığına həsr olunmuş tədqiqat istər bütövlükdə bir nitq hissəsi kimi zərf haqqında bilgilərin zənginləşdirilməsi, istərsə də temporal leksik vahidlərin nitqdə funksionallığı baxımından maraq doğurur[1]. Burada zərflər, M.İ.Rudometkinanın tədqiqatında olduğu kimi, *lokalizatorlar, korrelyatorlar* və *modifikatorlar* qrupuna bölünərək təsnif edilir.

N.A.Potayenko fransız dilində zaman mənalı sözlərin lüğətlərdə verilmiş definisiyaları əsasında temporal leksikanın təşkili prinsiplərini üzə çıxarmağa cəhd edərək zaman sahəsinin struktur-semantik modelini təklif edir[2]. Onun təklif etdiyi modeldə zaman sahəsi bir neçə qrupdan ibarətdir: 1) zamanı real obyekt kimi təqdim edən sözlər, yəni *substantivatlar* qrupu. Belə sözlərin mənasında zaman "uzunluq" («длительность») və ya "uzunluq nöqtəsi" («точка длительности») kimi təsəvvür edilir. 2) Zaman aidiyyəti, zaman daxilində nisbət, əlaqə bildirən sözlər, *korelyatorlar* qrupu; 3) Gerçəklikdəki hadisələrin səciyyəsini aşkara çıxararaq, onları zaman daxilindəki müddət, uzunluq baxımından səciyyələndirən sözlər, *parametrizatorlar* qrupu; 4) Mənasında temporallıq olmayan, amma temporallığı özündə zəruru element kimi ehtiva edən sözlər, *implikatorlar* qrupu.

---

[1] Василенко О.В. Функционирование наречий времени современного английского языка в текстах различных стилей. Автореф. дисс. ... канд. филол. наук. Киев, 1998.

[2] Потаенко Н.А. Словарные дефиниции как средство выявления принципов организации лексики (на материале слов со значением времени во французском языке) // вопросы языкознания. М., 1980. № 5, с.33-45.

Azərbaycan dilçiliyində temporal leksikanın araşdırılmasına həsr olunmuş xüsusi tədqiqat işləri yoxdur. Lakin həmin məsələyə ötəri nəzər salınması, temporal leksikaya aid müəyyən nümunələrin sadalanması hallarına rast gəlmək olar.

Azərbaycan dilində felin zamanlar sisteminin, zaman formalarının ümumi və xüsusi məna xüsusiyyətlərinin əhatəli şəkildə təhlil və təsvir olunduğu tədqiqatlarda müəlliflər əsas diqqəti fel formasının müstəqil şəkildə, digər ifadə vasitələrinin köməyi olmadan ifadə etdiyi məna xüsusiyyətlərinə yönəltmişlər. Amma bununla bərabər, həmin tədqiqatlarda fel formalarının kontekstlə bağlı zaman mənalarının ifadəsində leksik vasitələrin, əsasən zaman zərflikləri funksiyasında işlənən leksik vahidlərin rolu barədə ara-sıra qeydlərə rast gəlmək olur[1]. Belə tədqiqatlarda diqqəti cəlb edən cəhət ondan ibarətdir ki, felin zaman formalarına həsr edilmiş araşdırmalarda leksik vasitələrə dair cüzi material olsa belə, zamanın müxtəlifsəviyyəli ifadə vasitələrinin qarşılıqlı əlaqəsi hadisəsi bu işlərdə sezilmiş və nəzərə alınmışdır.

Son dövrlərdə dilçiliyimizdə Azərbaycan dilində felin zaman formalarının başqa dillərlə, xüsusilə ingilis dili ilə müqayisəli şəkildə araşdırıldığı bir sıra tədqiqatlarda və qrammatika kitablarında zamanın leksik ifadə vasitələrinə

---

[1] Bax: Axundov A.A. Felin zamanları, Bakı, 1961; Əfəndiyeva T. Felin keçmiş zaman formaları. Bakı, «Nurlan», 2005; Hüseynzadə M. Müasir Azərbaycan dili. Morfologiya. 3-cü hissə. Bakı, Maarif, 1983; Müasir Azərbaycan dili, II cild, Morfologiya. Bakı, Elm, 1980; Seyidov Y. Azərbaycan dilinin qrammatikası. Morfologiya (ikinci nəşr). Bakı: Bakı universiteti nəşriyyatı, 2002; Məşədiyev Q.İ. Zaman zərflərinin semantikası // Azərbaycan SSR EA Xəbərləri. Ədəb., dil və incəsənət seriyası, 1976, № 4, s. 88 – 94; Məşədiyev Q.İ. Zaman zərflərinin semantik xüsusiyyətləriniə dair // Azərbaycan dili və ədəbiyyatı tədrisi, 1976, №3 s. 71- 74 və s

nəzər yetirilmişdir[1]. Yuxarıda qeyd edilmiş tədqiqatlarda olduğu kimi, bunlarda da əsasən temporal zərflər araşdırılır, zaman nisbətinin dəyişməsində belə zərflərin rolundan danışılır.

Müxtəlif cümlə üzvəri arasında meydana çıxan zaman münasibətləri Azərbaycan dilinin sintaksisinə aid yazılmış kitablarda araşdırılır. Bu kitablarda zaman münasibətlərinin müxtəlif növ söz birləşmələri və hallar ilə ifadəsində zaman anlayışlı sözlərə və zaman zərfliklərinə toxunulmuşdur[2].

Zaman anlayışlı sözlərin araşdırıldığı tədqiqatlardan biri Azərbaycan dilinin leksik-semantik sisteminə həsr olunmuşdur[3]. Bu tədqiqatda Azərbaycan dilinin leksik-semantik sisteminin öyrənilməsinin nəzəri əsasları nəzərdən keçirilir, bu sahədə aparılan tədqiqatların metodikası və onların yekunlarına müəllif baxışı ortaya qoyulur. Müəllifin dillərin leksik siste-

---

[1] Cahangirov F.F. Perfekt zamanlar, Bakı, Elm, 2000.; Cəfərova B. İngilis və Azərbaycan dillərində felin zamanlar sistemi. Bakı, 2004; Məmmədov Z.M. İndiki və gələcək zaman formalarının potensial məna komponentlərindən biri haqqında: Alman və Azərbaycan dillərinin materialı əsasında // Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyi ali məktəblərinin elmi əsərləri. Dillər və ədəbiyyat seriyası, 1975, № 3, s. 75-81; Musayev O. İngilis dilinin qrammatikası. Bakı, 1979; Rəhimov M.Y. Fransız və Azərbaycan dillərində gələcək zaman formalarının qrammatik və məna xüsusiyyətləri haqqında // Azərbaycan Dövlət Universitetinin Elmi Əsərləri. Dil və ədəbiyyat seriyası, 1971, № 1, s. 73-77; Sadıqov R. Müxtəlifsistemli dillərdə obyektiv və qrammatik zaman əlaqələri. Bakı, Nurlan, 2004; Гусейнова Л. Система длительных времен глагола (на материале английского и азербайджанского языков). Баку, Нурлан, 2006.

[2] Kazımov Q. Müasir Azərbaycan dili. Sintaksis. Bakı, 2004; Müasir Azərbaycan dili. III cild. Sintaksis. Bakı, Elm, 1981; Abdullayev Ə. Z., Seyidov Y. M., Həsənov A. Q. Müasir Azərbaycan dili. Sintaksis. IV hissə, Bakı, Maarif, 1985.

[3] Cəfərov Q. Azərbaycan dilinin leksik-semantik sistemi. Bakı, Elm, 1984.

minin sinxron planda öyrənilməsinin perspektivləri barəsində mülahizələri də maraq doğurur. Əsərin müəyyən hissəsi zaman adlarının semantik sisteminə həsr olunmuşdur. Burada müəllif zaman vahidlərini, gün, ay, fəsil, il adlarını araşdırmış, zaman adlarından törəmə tematik söz qruplarını üzə çıxarmışdır.

Temporal leksika həm ayrı-ayrı türk dillərinin materialları üzrə, həm də türk dillərinin digər dillərlə müqayisəsi zəminində müəyyən dərəcədə öyrənilmişdir.

Məsələn, türkmən dilində zamanın leksik ifadə vasitələri ayrıca monoqrafik tədqiqat obyekti olaraq araşdırılmışdır[1]. Tədqiqatda zamanın leksik ifadə vasitələri funksional-semantik temporallıq sahəsinin bir komponenti kimi öyrənilərək sistemləşdirilmiş, leksik vasitələrlə realizə edilən temporal mənalar üzə çıxarılmış, qeyri-felli və yarımçıq cümlələrdə, eləcə də xəbəri vasitəli şəkil formalarında işlənən fellərlə ifadə olunan cümlələrdə zamanın leksik ifadə vasitələrinin reallaşdırdığı funksiyaların müəyyənləşdirilməsinə cəhd edilmişdir. Temporal leksikanın araşdırıldığı bütün tədqiqatlarda olduğu kimi, türkmən dilinin temporal leksik vahidlərinin semantik və komponent təhlili də onların izahlı lüğətlərdə qeydə alınmış lüğət definisiyaları əsasında aparılmışdır. Bu tədqiqatda temporal leksikanın əhatə dairəsi frazeologizmlər və sabit birləşmələr hesabına genişləndirilir.

Müasir özbək dilində temporal leksika semantik-sintaktik və morfoloji-sintaktik planda araşdırılmış, temporal birləşmələrin leksik-morfoloji əsası və onların struktur model-

---

[1] Атаева А. Лексическая средства выражения времени в туркменском языке. Автореф. дисс. ... канд. филол. наук. Ашгабат, 1993.

ləri aşkarlanmış, temporal birləşmələrin tipləri və onların dilin sintaktik quruluşu sistemində yeri müəyyənləşdirilmişdir[1]. Müasir özbək dilində temporal birləşmələrin iki tipinin olduğunu iddia edən müəllif onları yanaşma və idarə əlaqəsi əsasında formalaşan birləşmələr şəklində təsnif edir.

Temporal leksika qırğız dilinin materialları üzrə rus dili ilə müqayisəli planda tədqiq edilmişdir[2]. Tədqiqat temporal isimlər əsasında aparılmış və qırğız dilində temporal mənalı 100-ə qədər isim leksik-semantik və struktur-semantik cəhətdən rus dilinin materialları ilə qarşılaşdırılmışdır.

Cənub-qərb qrupu türk dillərinin materialları əsasında zərfləri araşdırmış Ə.Q.Quliyevin tədqiqatı yuxarıda sadalananlardan araşdırma səpkisi cəhətdən fərqlənir. Bu tədqiqatın bir hissəsi Azərbaycan, türk, türkmən və qaqauz dillərində *bayaq, indi, bildir, bugün, daha, dün//dünən, ertə, erkən, ikindi, tez* və s. əsli temporal zərflərin tarixi-müqayisəli səciyyəsinə və onların kök morfemlərinin bərpasına həsr edilmişdir[3].

## B. Temporal terminologiya haqqında

Yuxarıda zaman və ya temporal tematika üzrə terminologiyanın çoxşaxəli olması ilə bərabər, həmin termino-

---

[1] Шадманкулова Д. Х. Способы и средства выражения временных отношений в современном узбекском языке. Автореф. дисс. ... канд. филол. наук. Ташкент, 1990.

[2] Сыдыков А.Н. Лексико-семантическая микросистема со значением времени в русском и киргизском языках (на материале имен существительных). Автореф. дисс. ... канд. филол. наук. Бишкек, 1996.

[3] Гулиев А.Г. Наречие в тюркских языках юго-западной группы. Автореф. дисс. ... канд. филол. наук. Баку, 1983.

logiyanın şərhində aydın olmayan və ya qarışıq məsələlərin olduğu barədə danışmışdıq. Temporal leksikanın tədqiqinə həsr edilmiş araşdırmaları nəzərdən keçirdikdən sonra, bu tədqiqatlarda, eləcə də  Azərbaycan, rus və ingilis dillərində nəşr olunmuş dilçilik ədəbiyyatında yer almış temporal terminologiya, yəni zaman anlayışı üçün istifadə edilən terminlər barədə danışmağı lazım bilirik. Öncə zamanla bağlı ümumi terminləri, sonra isə temporal leksikaya dair terminləri nəzərdən keçirəcəyik.

T.Deşeriyeva zaman kateqoriyasının fiziki, fəlsəfi və linqvistik mahiyyətinə həsr etdiyi məqaləsində «zaman kateqoriyasının linqvistik aspekti» («лингвистический аспект категории времени»), «linqvistik zaman» («лингвистическое время»), «dil zamanı formaları» («языковые временные формы») terminlərindən istifadə edir[1]. «Лингвистический аспект категории времени» və «лингвистическое время» terminlərini sinonim kimi işlədən müəllif yazır: «Zaman kateqoriyasının linqvistik aspekti və ya linqvistik zaman dedikdə biz həmin kateqoriyanın fiziki və fəlsəfi aspektlərinin mahiyyətinin dil vasitələri ilə ifadə üsullarının bütün məcmusunu nəzərdə tuturuq»[2]. Müəllif «языковые временные формы» dedikdə zaman münasibətinin dildə  müxtəlif ifadə üsullarını (morfoloji, sintaktik, leksik, kontekstual) nəzərdə tutur[3].

«Linqvistik zaman» anlayış-termininin tamamilə başqa mənada işlədən M. Makovski onu dildəki dəyişmələrin tarixi

---

[1] Дешериева Т.И. Лингвистический аспект категории времени в его отношении к физическому и философскому аспектам //ВЯ, 1975, №2, с.111-117.

[2] Yenə orada, c. 111.

[3] Yenə orada, s. 112.

inkişaf prosesi ilə bağlayaraq, sinxron və diaxron planda dil sisteminin xassələri ilə əlaqələndirir[1]. M. Makovski linqvistik zamana müraciət edərkən iki cəhəti fərqləndirməyi tövsiyə edir: 1) *dilin dəyişməsi və mövcudluğunun hərəkətverici qüvvələrindən biri* kimi linqvistik zamanın öyrənilməsi və 2) *dildə zamanın ifadəsinin* (məsələn, qrammatik formalar, leksik mənalar, söz birləşmələrinin köməyilə) tədqiq edilməsi (ayırma mənimdir—T.İ). Məqalədə «linqvistik zamana» belə bir tərif verilir: «Linqvistik zaman dil strukturlarının təbii yüksələn xətlə inkişafının mövcudluq forması olub, öz-özünə dildəki dəyişmələrin bilavasitə səbəbi ola bilmir, dil kontiniumlarında onların struktur xüsusiyyətlərindən və onlara təsir göstərən dildaxili, dilxarici və sosial amillərdən asılı olaraq, həmin prosesləri sürətləndirməklə və ya ləngitməklə, yaxud onlar tərəfindən neytrallaşdırılmaqla, qeyri-bərabər şəkildə təzahür edir»[2]. Göründüyü kimi, müəllif linqvistik zamana dil vahidlərinin diaxron planda öyrənilməsi baxımından yanaşır.

«Dil zamanı»nı («языковое время») «linqvistik zaman»la qarışdırmamağı məsləhət görən E.Tarasovanın fikrincə, «dil zamanı»nı müxtəlif səviyyəli dil vasitələrinin, dərk edən subyektdən asılı olmayaraq dildə mövcud olan müxtəlif dil vahidlərinin və strukturlarının sistemi kimi başa düşmək lazımdır. «Linqvistik zaman»ı isə tədqiqatçı dilin metadil funksiyasını əks etdirən «ikinci dərəcəli» anlayış kimi izah edir: linqvistik zaman «özü özünü «dərk edən», təsvir edən

---

1 Маковский М. М. Понятие лингвистического времени // Иностранные языки в школе, 1976, № 6, с. 3.

2 Маковский М. М. Понятие лингвистического времени // Иностранные языки в школе, 1976, № 6, с. 3.

dildir, linqvistik zaman dil zamanının xarakteri haqqında elmi təsəvvürləri ifadə edir və ona (dil zamanına) müxtəlif yanaşma və interpretasiyalara imkan verən baxışlar sistemidir»[1]. Başqa sözlə desək, tədqiqatçı dil zamanını və linqvistik zamanı bir-birindən ontoloji və qneseoloji anlayışlar kimi fərqləndirir.

Qərbi Avropa dillərinə həsr olunmuş bir çox tədqiqat əsərlərində «linqvistik zaman» anlayışı «qrammatik zaman» məfhumu ilə eyniləşdirilir. «Linqvistik zaman» termini altında felin tərz-zaman sistemi çərçivəsində zaman münasibətlərinin ifadə edilməsi başa düşülür[2].

«Qrammatik zaman» termininin məna yükünü, fikrimizcə, ənənəvi nöqteyi-nəzər təşkil edir. Bu terminlə obyektiv real zamanın dildəki ifadəsi nəzərdə tutulur, obyektiv real zaman və qrammatik zaman qarşılaşdırılır. Bu da onunla izah edilməlidir ki, «qrammatika» termini əvvəllər bu və ya digər dilin qrammatik quruluşunu, yəni sözlərin dəyişmə və birləşməsinin qanunauyğun şəkildə mövcud olmasını və fəaliyyət göstərməsini ifadə etmişdir. «Bu mənada qrammatika tamamilə obyektiv səciyyə daşıyır, yəni o, dilin özünəməxsus mexanizmini əks etdirir»[3]. Digər tərəfdən, dilçiliyə dair qədim nəzəriyyələrdən yaxşı məlumdur ki, yunan dilinin qrammatikasının müəllifi olan Frakiyalı Dionisiyə görə, «qrammatika»

---

[1] Тарасова Е.В. Языковое поле темпоральности в синхронии и диахронии, Автореф. дисс. ... докт. филол. наук. Краснодар, 1993, с. 18.

[2] Declerck Renaat. Tense in English. Its structure and use in discourse. London and New York, 1991; Nordlander Johan. Towards a Semantics of Linguistic Time. Exploring Some Basic Time Concepts with Special Reference to English and Krio, Umea University, 1997.

[3] Axundov A.A. Ümumi dilçilik, Bakı,1979, s.144.

dil haqqında biliklərin məcmusu, yəni, ümumiyyətlə, dil haqqında elm demək idi[1]. Başqa sözlə desək, *qrammatika* müasir anlamdakı *linqvistika* anlayışının sinonimi olaraq işlənirdi. Təsadüfi deyildir ki, iki müxtəlif elm sahəsinə aid edilən məntiqi və qrammatik kateqoriyalar fərqləndirilir. Onların qarşılıqlı əlaqələrinə aid dilçilik ədəbiyyatında xeyli miqdarda araşdırmalara rast gəlmək olar[2]. İndi «qrammatik zaman» dedikdə felin zaman kateqoriyası nəzərdə tutulur. «Qrammatik zaman» termininin ilkin məna tutumunda, əgər belə demək mümkünsə, daralma baş vermişdir.

XX əsrin sonlarında meydana gələn *temporallıq* termini latın dilindəki *tempus* «zaman» sözündəndir. Əldə olan dilçilik terminləri lüğətlərinin heç birində «temporallıq» terminino təsadüf edilmir. Rus dilçiliyində sözügedən problemlə əlaqədar ədəbiyyatın araşdırılmasından belə qənaətə gəlmək olur: *temporallıq elə bir konseptual kateqoriyadır ki, onun əsasında iş, hal və hərəkətin zaman səciyyəsi dayanır*[3]. Tədqiqatlardan o da aydın olur ki, «temporallıq» termininin özünün ehtiva etdiyi məna yükündə də müxtəliflik nəzərə çarpır. Rus və slavyan dillərinin materialları əsasında temporallıq leksik-semantik sahəsinə həsr etdiyi tədqiqatında D.Q.İşuk «temporallığı» belə müəyyənləşdirir: «Temporallıq, bir tərəfdən, obyektiv (real) zamanla, digər tərəfdən, gerçəkliyin zaman münasibətlərinin insanların şüurunda əks olunması, inikası ilə, yəni

---

1 Античные теории языка и стиля, М-Л, 1936, с.106.

2 Мещанинов И.И. Соотношение логических и грамматических категории - В сб.: Язык и мышление. М., 1967; Панфилов В.З. Грамматика и логика. М.-Л., 1963.

3 Теория функциональной грамматики. Темпоральность. Модальность. Изд. Наука, Л., 1990, с. 5.

konseptual və perseptual zamanla əlaqəli olan obyektiv-subyektiv kateqoriyadır»[1].

Temporallığa eyni baxış bucağından yanaşmanı E.V. Tarasovanın araşdırmalarında müşahidə edirik. «Dil zamanı» anlayışını bütövlükdə «temporallıq» olaraq qəbul edən tədqiqatçı həmin terminin məna tutumunu bir qədər genişləndirir: «Dil zamanını (= temporallığı) insanın dil və ekstralinqvistik fəaliyyəti arasında münasibəti müəyyənləşdirən kateqoriyalara aid etmək olar... Dil zamanı real zamanın perseptual zaman vasitəsilə ifadəsidir... Beləliklə, temporallıq (=dil zamanı) gerçəkliyin xüsusi dərk olunma forması kimi təsəvvür oluna bilən özünəməxsus ikiplanlı obyektiv-subyektiv kateqoriyadır və özündə real, perseptual və individual zamanların xassələrini birləşdirir»[2].

Felin zaman formalarını dəqiqləşdirən və ya müşayiət edən, bu formaların qrammatik mənaları ilə oxşar mənalar ifadə edən leksik zaman göstəriciləri, yaxud zamanın leksik göstəriciləri anlayışı XX əsrin 60-cı illərinin sonlarından etibarən dilçilik ədəbiyyatında istifadə edilməyə başlanır. Həmin anlayışın meydana çıxması A.V. Bondarkonun[3] funksional-semantik kateqoriyalar və E.V.Qulıqa və E.İ. Şen-

---

[1] Ищук Д.Г. Лексико-семантическое поле как выражение концептуальной модели времени в языке. Дисс...канд.филол. наук. СПб, 1995, с. 31.

[2] Тарасова Е.В. Языковое поле темпоральности в синхронии и диахронии. Автореф. дисс. ... докт. филол. наук. Краснодар, 1993, s. 20.

[3] Бондарко А.В. К проблематике функционально-семантических категорий // Вопросы языкознания, 1967, № 2, с. 75-83; Бондарко А.В. Основы функциональной грамматики: Языковая интерпретация идеи времени. СПб.: Изд-во С.-Петербург. ун-та, 1999; Теория функциональной грамматики. Темпоральность. Модальность. Изд. Наука, Л., 1990.

delsin leksik-qrammatik, yaxud qrammatik-leksik sahələr haqqında nəzəriyyələrinin inkişafı ilə bağlı olmuşdur[1]. Məlum olduğu kimi, belə sahələrin strukturu nüvə və ya mərkəzdən, üstəgəl onunla qarşılıqlı əlaqədə olan periferiyadan ibarət olur. Sahənin strukturunda nüvə və ya mərkəz funksiyasını qrammatik kateqoriyalar, periferiya funksiyasını leksik, leksik-qrammatik və digər dil vasitələri yerinə yetirir.

Çox vaxt leksik və leksik-qrammatik vasitələri bir-birindən fərqləndirmədən ümumi şəkildə leksik vasitələr adı altında təqdim etmişlər. Leksik vasitələrə adətən zaman zərfləri, temporal isimlərin sözönü + hal şəkilçiləri ilə əmələ gətirdikləri birləşmələr, temporal isimlərin sifət və əvəzliklərlə birləşmələri aid edirlər.

Bir sıra tədqiqatlarda leksik və leksik-qrammatik vasitələrin fərqləndirilməsi istiqamətində mülahizələr irəli sürülmüşdür. Zamanın leksik ifadə vasitələrinə yalnız zaman zərfləri aid edilərək göstərilir ki, bu zamanın dildə ayrı-ayrı sözlər vasitəsilə ifadə edilməsidir[2].

M. V. Vsevolodova zaman münasibətlərinin ifadəsində leksik-qrammatik ifadə vasitələrinin rolunu tədqiq edərək onları ad nitq hissələrindən yaranan temporal genişləndiricilər adlandırır. O, temporal genişləndiricilərin və zərflərin linqvistik zaman kateqoriyası sistemində müxtəlif yarımsistemlərə aid olduğunu qeyd edir. Onun fikrincə, temporal zərflər zamanın leksik ifadə vasitələrinə aiddir, çünki hər birinin

---

[1] Гулыга Е.В., Шендельс Е.И. Грамматико-лексическое поле в современном немецком языке. М., 1969.

[2] Моисеев А.И. слова со значением времени в современном русском языке. – В кн. Слово в лексико-семантической системе языка. Л., 1973, с. 92-95.

mənası həmin leksem vasitəsilə təqdim olunur. Temporal genişləndiricilərin mənası isə söz formasında təsbit olunur, qrammatik məna daşıyır[1] . Bu müddəanı qəbul edən bir sıra tədqiqatçılar belə hesab edirlər ki, leksik zaman göstəricilərinin tərkibi, yəni zamanın leksik ifadə vasitələrinin sayı zaman zərflərinə sinonim olan frazeoloji tərkiblər və sabit birləşmələr hesabına genişləndirilə bilər[2].

Müxtəlif dillərin materialı üzrə zamanın leksik ifadə vasitələrinin semantikasının və funksionallığının öyrənilməsinə həsr edilmiş tədqiqat işlərində "zamanın leksik göstəriciləri" («лексические показатели времени»)[3], "zamanın leksik dəqiqləşdiriciləri" («лексические уточнители времени»)[4], "zamanın leksik müşayiətçiləri" («лексические сопроводители времени»)[5], "zamanın leksik indikatorları" («лексические индикаторы времени»), zamanın leksik

---

[1] Всеволодова М.В. О семантическом согласовании глаголов и именных темпоральных распространителей // Вопросы языкознания, 1979, № 1, с. 103-113.

[2] Алехина А.И. Фразеологическая единица и слово. К исследованию фразеологической системы. Минск, 1979, с. 11-12.; Семергей Р.А. Лексические показатели времени в современном русском языке (наречие и наречные выражения). Автореф. дисс. ... канд. филол. наук. Л., 1983, с. 8-9

[3] Семергей Р.А. Лексические показатели времени в современном русском языке (наречие и наречные выражения). Автореф. дисс. ... канд. филол. наук. Л., 1983, с.4.

[4] Демченко И.Г. Лексические уточнители временных отношений в современном немецком языке. Автореф. дисс. ... канд. филол. наук. М., 1973, с. 5.

[5] Шендельс Е.И. О грамматико-лексическом подходе к языку. – В. кн. Лингвистика и методика в высшей школе. М., 1970, с. 13-23.

lokalizatorları («лексические локализаторы времени»)[1], "zamanın leksik təyinedicilәri" (лексические определители времени)[2] və s. terminlərə rast gəlinir. Göründüyü kimi, bu terminlərdə zamanın leksik ifadə vasitələrinin əsas təyinatı, yəni felin zaman formaları ilə ifadə olunan zaman mənalarının göstəricisi, müşayiətçisi, dəqiqləşdiricisi, indikatoru, lokalizatoru olduğu bildirilir, vurğulanır.

Zamanın leksik ifadə vasitələri ilə bağlı sadaladığımız terminlərin heç birinə əldə olan dilçilik terminləri lüğətində rast gəlinmir. Bu da göstərir ki, həmin anlayışlar yenidir və onların unifikasiyası üçün hələ çox işlər görülməlidir.

---

[1] Тарасова Е.В. Языковое поле темпоральности в синхронии и диахронии. Автореф. дисс... докт. филол. наук. Краснодар, 1993, с. 24.

[2] Щёкина И.А. Лексические средства выражения временных отношений в современном итальянском языке. Автореф. дисс... канд. филол. наук. М., 1973, с. 11.

# I FƏSİL. TEMPORAL LEKSIKANIN SEMANTİK STRUKTURU

Temporal leksika temporallıq makrosahəsinin şaquli strukturunda özünəməxsus mövqeyi və rolu olan elementlərdən biridir. Hər bir dildə mühüm semantik funksiyalar daşıyan temporal leksika yekcinslik nümayiş etdirmir. Onların arasında elə vahidlər vardır ki, həm sintaqmatik, həm də paradiqmatik planda temporallıq ifadə edir. Bir sıra vahidlər isə sintaqmatik planda, başqa leksik vahidlərlə birləşmədə temporallıq mənasını nümayiş etdirsələr də, paradiqmatik planda bu mənaya malik olmurlar. Bəzi vahidlər hadisələri zaman çərçivəsində lokallaşdırır, bəziləri isə belə funksiya yerinə yetirə bilmirlər. Lokallaşdırma funksiyasında çıxış edən vahidlərin bir qrupu nitq momentinə görə zamanı ifadə edir, bir qrupu zaman münasibəti, digərləri isə müddət və ya uzunluq bildirir. Aparılan müşahidələr belə bir qənaətə gəlməyə əsas verir ki, temporal leksika bir-biri ilə sistemli qarşılıqlı əlaqəli qruplar şəklində strukturlaşmışdır. Həmin qrupların müəyyən hissəsi sabit vahidlərdən təşkil olunmuşdur və belə qruplara başqa vahidlərin daxil edilməsi qeyri-mümkündür. Başqa sözlə desək, onlar qapalı sistem əmələ gətirir. Məsələn, ay, gün, günün hissələri və fəsil adlarının daxil olduğu qruplar qapalı sistemə nümunə ola bilər. Saat, dəqiqə, həftə və ayın günlərinin miqdarı da qapalı sistemə aiddir. Digər qruplar açıq sistem əmələ gətirir.

Zaman anlayışının bir konseptual kateqoriya kimi əhatəli, dürüst, adekvat tərifinin verilməsi probleminin çətinliyi, mürəkkəbliyi bu problemin biliklərin aksiomatik səviyyəsində araşdırılması tələbi ilə şərtləşir. Bəllidir ki, zaman (məkanla

bərabər) materiyanın mövcudluq forması olub obyektiv mahiyyət daşıyır və həm kəmiyyət, həm də keyfiyyət xassələrinə malikdir. Zamanın, eləcə də məkanın ölçülməsi və hesablanması onun kəmiyyət xassələrindən asılıdırsa, zaman və məkan etibarilə daim hərəkətdə olan materiyanın subyektiv qavranması, dərk edilməsi zamanın, həmçinin məkanın keyfiyyət xassələri ilə bağlıdır.

Hər bir dildə zaman anlayışının bütün leksik ifadə vasitələrinin toplusunu kimi təsəvvür edilən temporal leksika bizi əhatə edən gerçəkliyin ümumi konseptual modelindəki mücərrəd zaman modelini əmələ gətirən temporal anlayışların sözlər şəklində verilməsi, təqdim edilməsi vasitəsidir.

Temporal leksikanın bir sıra xüsusiyyətləri onu konstruktiv tədqiqat obyektinə çevirməyə imkan verir. Bu, ilk növbədə zaman anlayışını ifadə edən dil vasitələrinin ümumi sistemində həmin leksik vahidlərin yerinin müəyyənləşdirilməsi, temporal leksikanın obyektiv şəkildə mövcud olan dilxarici aləmlə əlaqə və münasibətlərinin xarakterinin aydınlaşdırılması kimi bir çox məsələlərin işıqlandırılmasını tələb edir.

Temporal leksikanı qrammatik zaman kateqoriyasının tədqiqindən təcrid olunmuş şəkildə öyrənmək mümkün deyildir, çünki temporallıq anlayışının ifadəsində leksik və qrammatik vasitələr qarşılıqlı şəkildə əlaqəlidir. Əgər felin zaman formalarının vəzifəsi cümlədəki hadisələrin və proseslərin zaman əlaqəsini göstərmək, onları zaman daxilində lokallaşdırmaqdırsa, müvafiq rolu başqa dil vasitələri də yerinə yetirə bilir[1]. Həqiqətən, müxtəlif cümlə strukturlarında felin zaman

---

[1] Бондарко А.В. Грамматическая категория и контекст. М.-Л., 1971, с. 8-11.

formalarının köməyi olmadan da nəql olunan hadisələrin zaman daxilində lokallaşdırılmasının mümkünlüyünün şahidi oluruq. Bundan əlavə, fel formaları ilə reallaşan zaman planının çox vaxt temporal leksik ünsürlərlə tamamlanmasına rast gəlirik və bu yolla da temporal leksikanın təsriflənən felin aparıcı qrammatik kateqoriyasına təsir etdiyini görürük .

İngilis və Azərbaycan dillərinin izahlı lüğətlərində qeydə alınmış temporal leksikanın lüğət definisiyalarını nəzərdən keçirdikdə, onların leksik mənalarında aşağıdakıların öz əksini tapdığını aşkar edirik:

1) temporal leksika leksik məna etibarilə daim hərəkətdə olan, dəyişən ümumi mücərrəd zaman anlayışı ifadə edir;

2) bu sözlərin leksik mənasında müxtəlif uzunluğa malik zaman kəsiklərinə bölünmə və onların ölçülmə xüsusiyyətləri ifadə olunur;

3) həmin sözlərin leksik mənasında hər hansı bir hesablama və ya çıxış nöqtəsi, yəni nitq momenti, başqa bir hərəkət və hadisə ilə əlaqəli zamanın keçmiş, indiki və gələcək sferalarına bölgüsü təzahür edir;

4) temporal leksika iş, hal və ya hərəkətin zaman daxilində uzunluğa, intensivliyə, təkrarlığa, ardıcıllığa və s. xüsusiyyətlərə görə başvermə səciyyəsini bildirir;

5) temporal leksikanın mənasında ümumi zaman nizamı açıq-aşkar görünür.

Temporal sözlərin leksik mənalarında dünyanın zaman xassələri konseptual və perseptual zaman anlayışları vasitəsilə təmsil və ifadə olunur. Qeyd etmək lazımdır ki, daha geniş planda yanaşsaq, yuxarıda sadaladıqlarımız təkcə ingilis və Azərbaycan dilləri üçün deyil, həm də başqa dillərdəki temporal sözlər üçün xarakterikdir.

Struktur nöqteyi-nəzərindən yanaşsaq, hər bir dildə temporal leksika ümumi temporal məna ətrafında birləşmiş, bir-biri ilə qarşılıqlı əlaqəli mikrosahələrin, qrup və yarımqrupların iyerarxik şəkildə təşkil olunmuş sistemi şəklində təzahür edir.

Temporal leksika ingilis və Azərbaycan dillərinin izahlı və tərcümə lüğətlərində qeydə alınmış temporal leksik vahidlər əsasında toplanmışdır. İngilis dilinin sanballı leksikoqrafik mənbələri olan A.S.Hornby. Oxford Advanced Learner's Dictionary of Current English, Vol. 1-11, 1982, Большой англо-русский словарь və Cambridge Advanced Learner's Dictionary elektron lüğətindən müxtəlif nitq hissələrinə aid olan, zaman anlayışının dominant olduğu sözlər seçilmişdir. Leksemlərin mənalarının izahında *time* sözü və həmin sözün ideoqrafik sinonimlərinin işlənməsi seçmə meyarı kimi qəbul edilmişdir.

Azərbaycan dilində temporal leksika Azərbaycan dilinin izahlı lüğətlərində, azərbaycanca-ingiliscə və azərbaycanca-rusca lüğətlərdə qeydə alınmış, müxtəlif nitq hissələrinə aid olan, mənasında zaman anlayışının dominant olduğu sözlər seçilmişdir. Azərbaycan dilində temporal sözlərin mənalarının izahında «zaman» sözü və onun ideoqrafik sinonimlərinin işlənməsi seçmə meyarı qəbul edilmişdir.

Hər iki dil üçün qeyd olunmuş mənbələrdən toplanmış temporal anlayışlı sözlər kitabın sonunda sözlükdə verilmişdir.

Qarşılaşdırılan dillərdə temporal leksika seçilərkən bütün sadə, düzəltmə və mürəkkəb sözlər nəzərə alınmışdır. Yalnız sadə temporal leksikanın seçildiyi və törəmə sözlərin

nəzərə alınmadığı halda onların miqdarı hər bir dildə 130-150 arasında dəyişir.

Qarşılaşdırdığımız dillərin hər biri üçün seçilmiş temporal leksikanı iki qrupa ayırmaq olar. Birinci qrupa əsasən temporal isimlər və zərflər, eləcə də sifətlər daxildir. Bu sıradan olan isimlər zamanı real obyekt kimi, zaman müddəti kimi, zaman kəsikləri olaraq adlandırır. Zərflər isə hərəkət, hadisə və proseslərin zaman daxilindəki təkrarlığını, onların müddətini, davametmə uzunluğunu ifadə edir. İkinci qrupa müxtəlif nitq hissələrinə aid olan, «keçmiş-indiki-gələcək» planında ifadə olunan hərəkət, hadisə və proseslərin zaman əlaqəsi və münasibətlərini ifadə edən sözləri daxil etmək olar. Bu qrupların hər birini ayrıca mikrosahə hesab etmək olar.

Birinci qrupa qeyri-nisbi zamanı, ikinci qrupa isə nisbi zamanı ifadə edən sözlər daxildir.

### 1.1. Qeyri-nisbi zaman bildirən temporal vahidlər

Qeyri-nisbi zaman qrupunu təşkil edən sözləri aşağıdakı şəkildə qruplaşdırmaq olar:

**I. Müddəti müəyyən olan zaman kəsiklərinin adları**. Bunlara zamanın ölçü və hesablanma vahidləri daxildir:

***Azərbaycan dilində:*** *saniyə, dəqiqə, saat, gün, həftə, ay, il, qərinə, əsr, yüzillik, minillik.*

***İingilis dilində***: *second, minute, hour, day, week, fortnight, month, year, decade, century, millenium.*

Hər iki dildə bu leksik-semantik qrupa daxil olan isimlərin hər biri iyerarxiya cəhətdən özündən sonra gələni ehtiva edir. Məsələn, *miniillik* on *yüzillik*dən, *il* 12 *ay*dan, *ay* 4 *həftə*

və ya 28-31 *gün*dən, *həftə* 7 *gün*dən, *gün* 24 *saat*dan, *saat* 60 *dəqiqə*dən, *dəqiqə* 60 *saniyə*dən ibarətdir. Bunların hər biri qəbul edilmiş beynəlxalq zaman vahidləridir.

**II. Müddəti qeyri-müəyyən olan zaman kəsiklərinin adları.** Burada üç yarımqrupu fərqləndirmək olar:

1) zaman, vaxt müddətlərini ifadə edən ümumi sözlər – **azərb**.: *vaxt, dövr, interval, mərhələ, müddət, ara*; **ing.**: *period, interval, space, spell, stage, term, tide, while*;

2) böyük zaman kəsiklərini ifadə edən sözlər – **azərb**.: *era, epoxa, əbədiyyət*; **ing**.: *age, epoch, era, eternity*;

3) ən qısa zaman kəsiklərini ifadə edən sözlər – **azərb**.: *an, moment, qırpım, ləhzə, dəm*; **ing.**: *moment, instant, trice, wink.*

**III. Müddəti əsasən müəyyən olan zaman kəsikləri-nin adları.** Bura zaman kəsiklərinin mənası etibarilə daha konkret olan və dövri xarakter daşıyan sözlər daxildir. Onlar iki yarımqrup əmələ gətirir:

1) ilin fəsillərinin adları – **azərb**.: *yaz, yay, payız, qış*; **ing**.: *spring, summer, autumn (fall), winter*;

2) günün hissələrinin adları. Bu yarımqrupu da iki yerə bölmək olar:

a) günün əsas hissələrinin adları – **azərb.**: *gündüz, sə-hər, axşam, gecə*; **ing**.: *day, morning, afternoon, evening, night*;

b) günəşin vəziyyətinə görə günün hissələrinin adları – **azərb**.: *sübh, günçıxan, şəfəq, sabah, günorta, günbatan, qü-rub, toran, gecəyarı*; **ing**.: *midday, even, midnight, dawn, sunrise, sunset, evenfall, evenlight, twilight, forenoon, noon, noonday, forenight, daybreak, daytime, dusk.*;

**IV. Ayların və həftənin günlərinin adları.** Burada iki yarımqrupu fərqləndirmək olar:

1) ay adları – **azərb**.: *yanvar, fevral, mart, aprel, may, iyun, iyul, avqust, sentyabr, oktyabr, noyabr, dekabr*; **ing**.: *January, February, March, April, May, June, July, August, September, October, November, December*;

2) həftənin günlərinin adları – **azərb**.: *bazar ertəsi, çərşənbə axşamı, çərşənbə, cümə axşamı, cümə, şənbə, bazar*; **ing**.: *Monday, Tuesday, Wednesday, Thursday, Friday, Saturday, Sunday*;

III və IV qruplar həm müəyyən müddətli zaman kəsiklərini ifadə etmək, həm də dövri xarakter daşıması cəhətdən bir-biri ilə əlaqəli olan leksik vahidləri əhatə edir.

**V. Hərəkətin zaman daxilində müddətinə və ya uzunluğuna görə baş verməsini səciyyələndirən temporal sözlər**: – **azərb**.: *uzun, daima, daimi, həmişə, davamlı, ardıcıl, əbədi, əbədiyyən* və s. **ing**.: *long, always, constant, constantly, continuos, continuously, eternal, forever, permanent, still, permanently* və s.

**VI. Hərəkət, prosess və hadisələrin zaman daxilində təkrarlılığını ifadə edən sözlər:** – **azərb**.: *yenə (də), təkrar, təkrarən, adətən, tez-tez, gündəlik, bəzən, dövri* və s.; **ing**.: *again, frequently, repeatedly, usually, often, once, twice, houly, dayly, seldom, sometimes, rare, rarely, regularly, regular, periodical, periodically* və s.

**VII. İmplisit temporal mənalı sözlər.** Buraya aid leksik vahidlər müəyyən situasiyalarda bu sahəyə aid olan isimlərin funksiyalarına ekvivalent olan funksiyalarda işlənir. Belə isimlərin temporal mənası birbaşa yox, dolayısı ilə başa düşülür. Onlardakı zaman mənası implisit tərzdə onların ilkin

leksik-semantik variantlarında mövcud ola bilər. Belə sözləri aşağıdakı yarımqruplara bölə bilərik:

1. İnsanın yaş dövrlərinin adlarını bildirən sözlər – **azərb**.: *uşaqlıq, gənclik, qocalıq, ahıllıq*; **ing**.: *adolesence, adulthood, childhood, infancy, maturity, schooldays, youth* və s.; Buraya *ömür, ölüm, yaş* və *life, death, age* sözlərini də əlavə etmək olar;

2. Yemək adlarını bildirən leksik vahidlər – **azərb**.: *səhər (yeməyi), nahar, günorta (yeməyi) şam(yeməyi)* və s.; **ing**.: *breakfast, lunch, dinner, luncheon, supper, tea, high tea* və s.;

3. İnsanın təhsil, iş, istirahət və s. fəaliyyəti ilə əlaqədar olan dövrlərin adlarını bildirən sözlər – **azərb**.: *sessiya, tətil, məzuniyyət* və s.**;** **ing**.: *session, holidays, vacation* və s.

4. Təqvim anlayışlarını, bayramların adlarını bildirən leksik vahidlər – **azərb**.: *təqvim, Novruz Bayramı, Yeni il, Milad bayramı, Ordu Günü, Bilik Günü* və s.**;** **ing**.: *calendar, weekday, weekend, Ascension (Day), April Fool's Day, May Day, Boxing Day, Thanksgiving Day, Christmas Day, Xmas Day, New Year's Day* və s.

5. Təbiət və cəmiyyətin inkişaf tarixindəki dövrlərin adlarını bildirən leksik vahidlər – **azərb**.: *paleolit, neolit,feodalizm, Renessans* və s.; **ing**.: *paleolith, The Stone Age, The Bronze Age, The Iron Age, feudalism, capitalism, The Norman Conquest, the Renaissance* və s.

6. Cəmiyyətin həyatında baş verən hadisələrin, inqilabların, müharibələrin adlarını bildirən sözlər – **azərb**.: *Yüzillik müharibə, I Dünya müharibəsi, II Dünya müharibəsi* və s.; **ing**.: *The Great War, The First World War, World War II* və s.

## 1.2. Nisbi zaman bildirən temporal vahidlər

İndi isə nisbi zamanı ifadə edən ikinci qrupun vahidlərini nəzərdən keçirək. Yuxarıda qeyd edildiyi kimi, bu mikrosahəni əmələ gətirən sözlər keçmiş – indiki – gələcək planında hərəkətin temporal cəhətdən reprezentasiyası ilə bağlıdır . Onlar aşağıdakı bölgülərdə öz əksini tapır:

1. Nitq momentinə və ya istinad nöqtəsi kimi götürülən hər hansı hadisəyə nəzərən gerçəklikdəki **hadisə, proses və hərəkətlərin keçmiş – indiki – gələcək planında paylaşdırıldığını bildirən sözlər** – **azərb**.: *keçmiş, iniki, gələcək, dünən, bu gün, sabah, əvvəl, öncə, indi, sonra və s.*; **ing**.: *past, present, future, yesterday, today, tomorrow, yesternight, tonight, now, nowadays, current, currently, simultaneous, anterior, eve, prior, previos, former, last, next* və s.

2. **Bir hərəkət, hadisə və prosesin digərinə nəzərən zamanını ifadə edən sözlər** – **azərb**.: *əvvəl, qabaq, qabaqcadan, eynivaxtlı, eynizamanlı, sonra* və s.; **ing**.: *before, ago, beforehand, previously, formerly, simultaneously, contemporarily, while, recently, after, afterwards, later, lately, last, next, presently, then* və s.

3. **Zaman daxilində hərəkətin baş verməsini, cərəyan etməsini göstərən sözlər**. Bu qrupa varlıq, mövcudluq bildirən fellər və mərhələ, faza bildirən fellər daxildir – **azərb**.: *olmaq, mövcud olmaq, başlamaq, qurtarmaq, sona çatmaq, bitmək* və s.; **ing**.: *to be, to become, to grow, to get, to begin, to commence, to start, to end, to finish, to break* və s.

4. **Hərəkət, hadisə və prosesin zaman hüdudlarını, mərhələlərini bildirən sözlər** – **azərb**.: *başlanğıc, başlanış,*

*son, finiş, qədər* və s.; **ing**.: *beginning, end, ending, till, until* və s.

5. **Zamanın ümumi ardıcıllığını ifadə edən sözlər** – **azərb**.: *əvvələn, əvvəl, öncə, nəhayət, sonda* və s.; **ing**.: *firstly, (at) first, at last, beginning, commencement, middle, midst, end, ending* və s.

6. **İmplisit temporal mənalı sözlər** – **azərb**.: *artıq, hələ, bəri* və s.; **ing**.: *already, still, yet, as, as….as, since, scarcely….when, no sooner ... than, in, at, on* və s.

Beləliklə, qarşılaşdırılan dillərdə temporal leksika nisbi və qeyri-nisbi zamanı ifadə edən iki böyük qrup vasitəsilə təmsil olunur. Onları bir-birindən təcrid olunmuş şəkildə təsəvvür etmək olmaz. Bu səbəbdən onların arasındakı sərhədləri dəqiq müəyyənləşdirmək çətinlik törədir. Qrupları əmələ gətirən leksik vahidlər bir-biri ilə qarşılıqlı şəkildə əlaqəlidir və bu əlaqə nitq prosesində təzahür edir. Məsələn, ingilis dilində «müəyyən müddətli zaman kəsiyi» mənasında *day, moment, minute* və s. sözlər Birinci qrupun vahidləri kimi çıxış edərək qeyri-nisbi zamanı, lakin *for the moment* «1. hazırda, bizim dövrümüzdə; 2. yaxın gələcəkdə», *one of these days* «yaxın günlərdə» və s. sabit birləşmələrdə İkinci qrupun vahidləri kimi nisbi zaman ifadə edir.

Hər bir dildə olduğu kimi, müasir ingilis və Azərbaycan dillərinin leksik-semantik sistemində də temporallıq sahəsinin əsasını ictimai şüurda mövcud olan, dünyanın konseptual modelinə daxil olub ən mühüm zaman anlayışlarını ifadə edən sözlər təşkil edir. Bu baxımdan yanaşdıqda, qeyri-nisbi zamanı ifadə edən, obyektiv real zamanın ingilis və azərbaycanlı şüurunda inikas olunmaqla onların dillərində zaman modelinin daşıyıcıları olan sözlərdən təşkil olunmuş Birinci qrupa

daxil olan leksik vahidlər özlərinin rəngarəng leksik-semantik variantları ilə temporallığın sosial-etnik, məişət, bədii-təsviri və terminoloji refleksiyasını əks etdirir. Gerçəkliyin zaman münasibətlərinin qarşılaşdırdığımız dillərdə ifadə olunmasında təkcə leksik temporal vasitələr deyil, bütün səviyyələrin dil vasitələri iştirak edir. Leksik temporal vasitələrlə birgə morfoloji, sintaktik və frazeoloji temporal vasitələr hər bir dil üçün vahid və bütöv bir temporallıq sahəsini əmələ gətirir.

### 1.3. Əsas temporal leksik vahidlər

Azərbaycan və ingilis dillərinin leksik-semantik sistemində temporal leksikanı təmsil edən əsas leksik vahidlər bir neçə əlamətə görə seçilir. Həmin əlamətlər əsas sözləri aşağıdakı cəhətdən xarakterizə edir.

1. Əsas temporal leksik vahidlər leksik sistemin semantik strukturunun təşkilində iştirak etməklə sahənin nüvəsinə daxil olur;
2. Əsas temporal leksik vahidlərdə sahənin adı kimi çıxış edən *zaman* və *time* sözləri ilə ən çox semantik yaxınlıq müşahidə edilir;
3. Əsas temporal leksik vahidlər yüksək işlənmə tezliyi ilə xarakterizə olunur, dilin aktiv lüğət tərkibinə daxil olur;
4. Əsas sözlərin yüksək işləklik səviyyəsi və leksik sistemdə mərkəzi mövqedə dayanması, hər şeydən əvvəl, dil sistemi üçün mənşə etibarilə qədimliyi və əslliyi, yaxud alınma söz olaraq ədəbi dildə tam mənimsənməsi və adaptasiya olunması ilə bağlıdır

Temporal leksikanı yuxarıda iki mikrosahəyə böldüyümüzə görə, iki qrup əsas əsas leksik vahidlərdən də bəhs etmək olar. Birinci qrup əsas leksik vahidlər qeyri-nisbi zamanı bildirən sözlərdən ibarət mikrosahənin nüvəsinə, ikinci qrup əsas leksik vahidlər isə nisbi zamanı bildirən sözlərdən ibarət mikrosahənin nüvəsinə daxil olur. Qruplardakı əsas vahidlərin işləklik tezliyi Azərbaycan və ingilis dillərinin qəzet leksikası üçün tərtib edilmiş tezlik lüğətlərində[1] qeydə alınmış nəticələrə əsasən verilir. Azərbaycan qəzet dilinin tezlik lüğəti ilə bağlı bir məsələni öncədən qeyd etmək lazımdır. Lüğət 2004-cü ildə nəşr olunsa da, onda XX əsrin 70-ci illərinin materialları əks olunmuşdur və seçmə həcmi kifayət qədər azdır. Lüğət müəlliflərinin özlərinin də etiraf etdiyi kimi, "... seçmənin həcmi tezlik lüğətinin mühüm səciyyəsi hesab olunur. Çünki lüğətin statistik etibarlılığını və buna müvafiq olaraq lüğətin müxtəlif tətbiqləri üçün yararlılığını təhlil edilmiş materialın həcmi müəyyən edir. ... Seçmənin həcmi nə qədər böyük olarsa, tezlik lüğətindən alınan məlumat da bir o qədər də etibarlı olar."[2]. Lüğətin təcrübi xarakterdə olmasını və lüğətin tərtib edildiyi dövrdə texniki və digər çətinlikləri nəzərə alan müəlliflər seçmənin həcmini təxminən 82 min sözişlətmə səviyyəsində qəbul etmişlər. Tədqiqatımızda onun nəticələrinin istifadə edilmə-

---

[1] Azərbaycan qəzet dilinin tezlik lüğəti (Tərt. K.Vəliyeva, M.Mahmudov, V. Pines). Bakı, Nurlan, 2004; Частотный англо-русский словарь-минимум газетной лексики (Сост. П.М.Алексеев, Л.А.Турышна). М., Воениздат, 1984.

[2] Azərbaycan qəzet dilinin tezlik lüğəti (Tərt. K.Vəliyeva, M.Mahmudov, V.Pines). Bakı, Nurlan, 2004, s. 7.

sində bütün bu çətinliklərə baxmayaraq, dilimizdə ilk tezlik lüğəti kimi onun əhəmiyyətini xüsusi qeyd etmək lazımdır.

Beləliklə, qeyri-nisbi zaman mikrosahəsi üçün yuxarıda göstərilən əlamətlər üzrə seçilmiş əsas temporal leksik vahidlər aşağıdakılardır:

***Azərbaycan dilində***: mikrosahənin adı və temporal mənalı ən ümumi vahid – *zaman* (67); müddəti qeyri-müəyyən olan zamanı bildirən vahidlər – *vaxt* (149), *dövr* (42); müxtəlif uzunluğa, müddətə malik zaman kəsiklərini bildirən vahidlər – *saniyə* (3), *dəqiqə* (9), *saat* (31), *gün* (264) // *gündüz* (8), *gecə* (14), *həftə* (18), *ay* (96), *il* (611), *əsr* (12); ən qısa zaman kəsiyini bildirən vahid – *an* (2)

***İngilis dilində***: mikrosahənin adı və temporal mənalı ən ümumi vahid – *time* (414); müddəti qeyri-müəyyən olan zamanı bildirən vahid – *period* (86); müxtəlif uzunluğa malik zaman kəsiklərini bildirən vahidlər – *second* (6), *minute* (32), *hour* (135), *day* (372), *night* (106), *week* (361), *month* (296), *season* (54), *year* (878), *century* (44); ən qısa zaman kəsiyini bildirən vahid – *moment* (23).

Nəticələrdə Azərbaycan dilinin əsas temporal vahidlərinin tezlik göstəricilərinin ingilis dilindəkindən çox aşağı olduğu görünsə də, bunların izahı mümkündür. Birincisi, artıq qeyd edildiyi kimi, Azərbaycan dilində seçmə həcmi təxminən 82 min sözişlətməni əhatə etdiyi halda, ingilis dilində bu, təxminən 500 min sözişlətməni əhatə edir. İkincisi, Azərbaycan dilində əsas temporal vahidlərin tezliyinin aşağı olması, heç də onların az işlək olması demək deyildir. “Azərbaycan qəzet dilinin tezlik lüğəti”nin müəlliflərinin də qeyd etdikləri kimi, “sözün işləkliyinin müəyyənləşdirilməsi üçün təkcə onun tezliyini deyil, həm də onun işləndiyi mətnlərin

sayını nəzərə almaq lazımdır.”[1]. Buna görə də, Azərbaycan dilində əsas temporal vahid kimi seçdiyimiz sözlərin tezlik və yayılma dərəcəsi göstəricilərini də lüğətə əsasən veririk.

| ***Söz*** | ***Tezlik*** | ***Yayılma*** |
|---|---|---|
| Zaman | 67 | 41 |
| vaxt | 149 | 59 |
| dövr | 42 | 38 |
| saniyə | 3 | 1 |
| dəqiqə | 9 | 7 |
| saat | 31 | 19 |
| gün | 264 | 84 |
| gündüz | 8 | 7 |
| gecə | 14 | 11 |
| həftə | 18 | 12 |
| ay | 96 | 44 |
| il | 611 | 70 |
| əsr | 12 | 8 |
| an | 2 | 2 |

Göründüyü kimi, əsas temporal vahid olaraq seçdiyimiz sözlərin çoxunun yayılma dərəcələri onların kifayət qədər işlək olduğunu əyani şəkildə göstərir.

Bununla belə, seçdiyimiz əsas temporal leksik vahidlərin tezlik göstəricilərinin doğruluğuna bir daha əmin olmaq məqsədilə, bədii ədəbiyyat nümunələri əsasında 650 minlik və qəzet materialı əsasında 120 minlik söz massivi üzərində

---

[1] Azərbaycan qəzet dilinin tezlik lüğəti (Tərt. K.Vəliyeva, M.Mahmudov, V.Pines). Bakı, Nurlan, 2004, s. 10.

statistik hesablamalar aparmağı qərarlaşdırdıq. Bədii ədəbiyyat nümunələri müasir yazıçıların (Anar, Elçin, Ə.Əylisli, Ə.Cəfərzadə, İ.Şıxlı, S.Əhmədli, S.Səxavət, Y.Səmədoğlu və s.) nəsr və dram əsərlərindən seçilmişdir. Qəzet materialları "Azərbaycan", "Ayna" və "Şərq" qəzetlərinin internet versiyalarından toplanmışdır. Qəzet materialı mətnlərin məzmununa görə sənaye, kənd təsərrüfatı, siyasət, incəsənət, xəbərlər, idman və s. məlumatları əhatə edir. Statistik göstəricilər yalnız söz kökləri əsasında verilir.

| Sözlər | Bədii Ədəbiyyat | Qəzet materialı |
|---|---|---|
| zaman | 396 | 288 |
| vaxt | 1413 | 174 |
| dövr | 172 | 190 |
| saniyə | 25 | - |
| dəqiqə | 229 | 16 |
| saat | 694 | 26 |
| gün | 2858 | 434 |
| gündüz | 99 | - |
| gecə | 748 | 13 |
| həftə | 127 | 23 |
| ay | 195 | 56 |
| il | 923 | 773 |
| əsr | 232 | 74 |
| an | 248 | 13 |

Nisbi zaman mikrosahəsinin nüvəsinə daxil olan və yuxarıda göstərilən əlamətlər üzrə seçilmiş əsas temporal leksik vahidlər zamanı gerçəklikdəki hadisə, proses və hərə-

kətlərin keçmiş, indiki və gələcək planında paylaşdırıldığını nitq momentinə və ya istinad nöqtəsi kimi götürülən hər hansı hadisəyə nəzərən ifadə edir. Bu qrupa aid əsas leksik vahidlər də qarşılaşdırılan dillərdə böyük işlənmə tezliyi ilə xarakterizə olunurlar. Göstərilən leksik vahidlər üçün hər iki dilin qəzet leksikasının tezlik lüğətlərində qeydə alınmış tezlik göstəriciləri aşağıdakılardır:

***Azərbaycan dilində:*** *keçmiş* (21), *indiki* (7), *gələcək* (44), *dünən* (18), *sabah* (7), *əvvəl* (111), *indi* (106), *sonra* (98) və s.

Azərbaycan dilində *bu gün* sözü ayrı yazıldığına görə lüğət müəllifləri onu söz birləşməsi hesab edərək lüğətə daxil etməmişlər.

***İngilis dilində:*** *past* (64), *present* (116), *future* (94), *yesterday* (318), *today* (52), *tomorrow* (63), *now* (167), *ago* (118), *last* (31), *next* (173) və s.

Nisbi zaman mikrosahəsini əmələgətirən qruplar açıq olduğu üçün temporal leksik vahidlərdə müəyyən sərbəstlik hiss olunur, onlar müxtəlif leksik-semantik variantlarda müxtəlif qruplara daxil olur.

Mikrosahələr üçün əsas leksik vahidləri müəyyənləşdirdikdən sonra qarşılaşdırdığımız dillərdə zaman anlayışının ən ümumi şəkildə ifadə edən sözlərin semantik təhlilini verməyə çalışaq.

### 1.4. *Time* sözünün semantik təhlili

İngilis dilində temporal leksik vahidlər arasında «time» sözünün seçilməsi təsadüfi deyildir. Bu söz ingilis dilində leksik temporallıq sahəsinin semantik strukturunun təşkilində

iştirak edir, yəni onun mənaları ətrafında temporal leksik vahidlər qruplaşır, qrup və yarımqruplar əmələ gəlir. «Time» sözü ingilis dilində yüksək işlənmə tezliyinə malik olmaqla, fəal lüğət tərkibinə daxildir və bu dilin leksik temporallıq sistemində mərkəzi komponentlərindən biridir.

*Time* sözü ingilis dilində sözyaratmada ən çox iştirak edən leksik vahid kimi seçilir. Bu sözün törəmələri arasında 67 isim, 17 sifət, 4 zərf, 4 fel, 1 nida və 1 şəkilçi vardır[1].

Temporal mənalı bütün isimlər arasında «time» leksemi çox qədim dövrlərdən ən böyük çoxmənalılığa malik söz olmuşdur. İndi bu söz ingilis dilində «zaman» mənasını ən ümumi və geniş şəkildə ifadə etməklə bərabər, həm də zaman sahəsinin adı kimi çıxış edir. Ona görə də sahəyə daxil olan sözlərin məna ümumiliyini müəyyən etmək üçün «time» sözünün özünün hansı məna komponentlərindən ibarət olduğunu üzə çıxarmaq lazımdır. İngilis dilinə dair izahlı və elektron lüğətlərdə və b. leksikoqrafik mənbələrdə «time» sözü çoxmənalı söz kimi qeydə alınmışdır. Lüğətlərdə «time» sözünün 14[2], 16[3], 17[4], 28[5], 52[1], 67[2] məna və məna çalarının olduğu göstərilir.

---

[1] Cambridge Advanced Learner's Dictionary. Cambridge University Press, 2003. Version 1.0. COPIRIGHT © Software TEXTware A / S, Copenhagen, 2003, http: // www. textware. dk.

[2] Hornby A.S. Oxford Advanced Learner's Dictionary of Current English, Vol. II, Moscow - Oxford , 1982, pp. 401-402.

[3] The American Heritage Dictionary of the English Language, William Morris, Editor, Published by American Heritage Publishing Co., Inc. and Haughton Mifflin Company, Boston, p. 1346

[4] Merriam-Webster's Collegiate Dictionary, 10-th edition, Merriam - Webster, Incorporated Springfield, Massachusetts, U.S.A., 2000, p. 1235

[5] Webster's New International Dictionary of the English Language, Second Edition, Unabridged, London: G. Bell & Sons, Ltd, Springfield, Mass.: G

İngiliscə-azərbaycanca lüğətdə «time» sözünün aşağıdakı mənaları göstərilmişdir: 1. vaxt, zaman, çağ; 2. müddət, vaxt; vədə, möhlət; 3. dövr, zaman; 4. iş vaxtı; 5. həyat, ömür; əsr; 6. dəfə[3].

Bütün bu mənaları nəzərdən keçirdikdə, məlum olur ki, göstərilənlər «time» sözünün kontekst və ya situasiya ilə bağlı işlənməsindən irəli gələn məna çalarlarıdır. Başqa sözlə desək, onların işlənməsi kontekstlə şərtlənir. Onların hamısını aşağıdakı mənalarda birləşdirmək olar:

1. «İş, hal və hərəkətin keçmişdən indiyə və indidən gələcəyə doğru geridönməz ardıcıllıqla cərəyan etdiyi, baş verdiyi qeyri-məkani bir bütövlük, tamlıq (continuum)»[4] şəklində ümumfəlsəfi məna;

2. Həmin qeyri-məkani bütövlükdə və ya continuumda hansısa zaman nöqtələri arasında zamanın cərəyan etməsini müəyyənləşdirən mənalar, yəni «interval, ara, dövr, period»: Onları aşağıdakı şəkildə daha da konkretləşdirmək olar:

2.1. sözügedən qeyri-məkani bütövlüyün iki nöqtəsini birləşdirən və ya ayıran interval, ara, dövr, period, uzunluq. Məsələn: *a long time since the last war.*

---

& C. Merriam Co. (1934), Volume II, Letters M-Z, with Appendices, p. 2648.

[1] The Oxford English Dictionary, Volume X1, T-U, Oxford, At the Clarendon Press, pp. 37-42.

[2] The Random House Dictionary of the English Language, The Unabridged Edition, Jess Stein, Editor in Chief, Random House / New York, , p. 1485.

[3] İngiliscə-azərbaycanca lüğət , Bakı, «Qismət», 2003, s.1438

[4] The American Heritage Dictionary of the English Language, William Morris, Editor, Published by American Heritage Publishing Co., Inc. and Haughton Mifflin Company, Boston, p . 1346

*There has been **a long time since** - I do not say it lasted long, but it has been - when I have asked myself the question* (Ch.Dickens); "*It's **a long time since** I was at the Louvre* (E.Voynich). *He looked up at my window as he passed, and I recognized him, though he had changed much in the fifteen years that had elapsed since we last met* (A.Cristie).

2.2. oxşar iş, hal və hərəkətlərlə müşahidə edilən, nəzə-rə çarpan, qeyd olunan, xüsusilə bir neçə illik interval, ara, dövr, period: *hard time, hard times, heavy times, a time of troubles* və s.

*He begged Captain Bonneville, therefore, to travel very slowly, so as to keep the horses in strength and spirit for the **hard times** they would have to encounter* (W.Irving); *I think it was a day or two before, but I am conscious of confusion in my mind about that **heavy times*** (Ch.Dickens). *He had **a hard time** of it, but did not know it* (M.Twain). *There was a long **hard time** when I kept far from me, the remembrance, of what I had thrown away when I was quite ignorant of its worth* (Ch.Dickens). *The firm had ceased to prosper, and fi-nally, in the **hard times** of 1893, had gone out of business* (A.Cristie). *… it was now become to me, -- "a very pleasant refuge in **time of trouble**." It had been a mild, serene spring day -- one of those days which, towards the end of March or the beginning of April, rise shining over the earth as heralds of summer* (Th.Dreiser).

2.3. Konkret fəaliyyətlə müşahidə edilən, nəzərə çarpan dövr, period; gərgin fəaliyyət dövrü; ənənəvi iş dövrü, məsə-lən: *harvest time, time for bed, hired for full time, part-time*.

*I felt it was a **time for conversation** and confidence* (Ch.Dickens). *Whether you are seeking a **part-time** job to*

*earn extra cash throughout the school year, or a **full-time** job upon graduation our job lists will help you* (LingvoUniversal (En-Ru). I had no ***time for formalities*** (J.London).

3. «Zaman anı, zaman momenti» anlayışı ətrafında cəmləşən mənalar:

3.1. mümkün olan an, moment və ya mövsüm: *at any time, for the only time.*

*There never had yet been **a time when** man in bulk was more courageous* (Ch.Dickens). *Little Emily came and sat beside me on the locker **for the only time** in all that visit; and it was altogether a wonderful close to a wonderful day* (Ch.Dickens). *The little intercourse I have **at any time** with those around me cannot be termed conversation* (W.Irving). *In fact the Church Mission Society, the charity founded by Wilberforce himself to fight injustice, estimates that there are more people enslaved today than **at any time** in history: 20 million, compared with four million when the 1807 Act was passed* (Times-online).

3.2. ölüm və ya doğuluşla bağlı qeyd olunan an, moment və ya nöqtə: *a later time of life; before one's time.*

*I am sure I loved that baby quite as truly, quite as tenderly, with greater purity and more disinterestedness, than can enter into the best love of **a later time of life**, high and ennobling as it is* (Ch.Dickens). *He died **before his time**; **His time** is near. Do you remember a French master with a squeaky voice? Or perhaps he was **before your time**?* (LingvoUniversal (En-Ru)

3.3. bir neçə andan, momentdən biri: *the last time, three times, for the second times.*

*The* ***last time*** *he saw Scott, he told him he believed him* (W.Irving). *When the train stops that* ***last time****, they take after me hot-footed* (J.London). *I'd* ***ten times*** *rather do this work myself than ask him to do it* (LingvoUniversal (En-Ru). *I have been hit by lanterns* ***two or three times*** (J.London). *I repeated myself* ***several times****, and occasionally had to go back to some detail that I had forgotten* (J.London).

4. Musiqi ritminin zərbəsi; musiqi parçasının ifa edildiyi sürət səviyyəsi; temp kimi mənalar ayrıca göstərilir.

Beləliklə, lüğət məqalələrinin təhlili göstərir ki, mahiyyət etibarilə «time» sözü ümumfəlsəfi məna ilə birgə, «interval, ara, dövr, period», «an, moment, nöqtə» və «ritm» mənalarına malikdir.

«Time» sözünün müasir ingilis ədəbi və xalq dili üçün aktual, əsas mənası – «gerçəklikdə cərəyan edən hadisə, proses və hərəkətlərin əsrlər, illər, saatlar, dəqiqələr və saniyələrlə ölçülən davam müddəti, uzunluğu»[1] - zaman kəsiklərinin adlandırılmasında onun ümumi söz olduğunu göstərir.

Bu sözün fəlsəfədə işlənən leksik-semantik variantı isə, yəni «*sonsuz inkişaf edən materiyanın obyektiv mövcudluq formalarından biri*» özünün ifadə etdiyi məna həcmi baxımından xeyli dərəcədə genişdir və bu səbəbdən də müəyyən anlayışların qurulmasında istifadə olunur.

[1] Hornby A.S. Oxford Advanced Learner's Dictionary of Current English, Vol. II, Moscow - Oxford , 1982, pp. 401-402.

### 1.5. *Zaman* və *Vaxt* sözlərinin semantik təhlili

Azərbaycan dilində temporal leksik vahidlər arasında "zaman" və "vaxt" sözlərinin seçilməsi də təsadüfi deyildir. Temporal leksik vahidlər üçün uzunluq ümumi anlayış məzmunu götürülür. Amma həmin vahidlərin ifadə etdikləri və ya işarələdikləri anlayış müxtəlif şəkildə dəyişir. Bu dəyişmə özünü bütöv bir tamdan onun hissələrinə qədər göstərir. Tamda qeyri-məhdud uzunluq müşahidə olunur. Onun hissələri isə maksimal və minimal uzunluğa malik ola bilər. Demək, zaman anlayışı özündə müxtəlif uzunluğa malik zaman kəsikləri anlayışını ehtiva edir. Bunlar tam və onun hissələri kimi bir-biri ilə əlaqələnir.

Azərbaycan dilində "zaman" və "vaxt" sözləri komponentlərinin polisemantikliyinə görə semantik cəhətdən təhlil üçün çətinliklər yaradır. Üstəgəl Azərbaycan dilinin izahlı lüğətlərində "zaman" və "vaxt" sözləri ilə bağlı verilən məlumatların arzulanan səviyyədə olmamağı da semantik təhlilin aparılması üçün lazımi şərait yaratmır. Qeyd edək ki, «zaman» sözü «vaxt» sözünə nisbətən daha geniş şərh oluna bilsə də Azərbaycan dilinin izahlı lüğətlərində bunun əksi ilə rastlaşırıq. Bu səbəbdən, "zaman" və "vaxt" sözlərinin semantik təhlilinə keçməzdən öncə, bu sözlərin lüğətlərdə verilən izahatını nəzərdən keçirık.

«Zaman» sözü üçün lüğətlərdə verilmiş izahatı belədir:

«ZAMAN, .... 1. Vaxt, müddət, *O hadisədən çox zaman keçdi. – Unudubsan məni xeyli zamandı*. Aşıq Ələsgər. ... *Bu qədər zaman paytaxtdan ayrıldığı heç yox idi*... Ü.Hacıbəyov. *Aradan üç aya qədər bir zaman keçmişdi.* S. Hüseyn. (Beyrək) *zamanın yetişdiyini görüb yumruğunu ma-*

*saya çırpdı.* M. Rzaquluzadə. // Adətən fellərdən sonra – bir hadisənin, işin baş verdiyi və ya baş vermiş olduğu vaxtı, anı bildirir. *O, danışdığı zaman mən getmişdim...* // Zəmanə, dövr, vaxt. *Yaxşı zamanda yaşayırıq. – Mirzənin zamanında bazarda ucuzluq idi.* Ə.Haqverdiyev. *Zamanmı, insanmı dəyişdi yoxsa*. B.Vahabzadə.

2. Fəlsəfədə: sonsuz inkişaf edən materiyanın, vaxtın davamı və ardıcıllığında təzahür edən ümumi obyektiv varlıq forması. *Məkan və zaman hər cür varlığın əsas formalarıdır.*

3. Qrammatikada: iş və hərəkətin müəyyən vaxtda icra edilib-edilmədiyini bildirən fel şəkli. *Keçmiş zaman şəkilçiləri. Qrammatik zaman anlayışı*...»[1]. Sonra isə zaman sözü ilə bağlı birləşmələr sadalanır.

Eyni izahata üçcildlik izahlı lüğətdə də rast gəlirik[2].

"Zaman" sözü üçün fərqli izahat Azərbaycan dilinin bircildlik izahlı lüğətində verilmişdir:

ZAMAN – is 1. Vaxt, çağ; 2. Müddət; 3. Zəmanə, dövr, fəsillər. Δ keçmiş ~, gələcək ~, indiki ~ [3].

İzahlı lüğətlərdə «vaxt» sözü üçün verilən izahata diqqət yetirək:

«VAXT, ... 1. Cərəyan edən bir işin, hadisənin və s.-nin əsrlər, illər, saatlar, dəqiqələr, saniyələrlə ölçülən davam müddəti; zaman.

2. Saatların, günlərin, illərin ardıcıl surətdə bir-birini əvəz etməsi. *Vaxt nə tez keçdi.*

---

[1] Azərbaycan dilinin izahlı lüğəti. I cild (red.: prof. Ə.Orucov), Bakı, Azərb. SSR EA nəşriyyatı, 1966, s. 319-320.

[2] Azərbaycan dilinin izahlı lüğəti. I cild, Bakı, «Çıraq», 1997, s. 431.

[3] Axundov A. Azərbaycan dilinin izahlı lüğəti. Bircildlik. Bakı, Elm, 2005, s. 445.

3. Bir hadisənin, işin baş verdiyi, baş verəcəyi yaxud baş verməli olduğu an, moment. İclasın vaxtını təyin etmək. – *Vaxt yetişdi*, ... // Eyni mənada bəzən fellərdən sonra işlənir. *Kəramət uşaqlarını ancaq yatdıqları yerdə, yuxulu olduqları vaxt oxşayar, öpərdi...*

4. Dövr, zəmanə, çağ. *Çar hökuməti vaxtında. Uşaqlıq vaxtı. Axır vaxtlarda. Bizim vaxtımızda* (yaşadığımız dövrdə, bizim dövrdə). – *Vaxt bir vaxt idi ki, şəhərlərdə məktəb az tapılardı*. Nərimanov.

5. Günün, ayın, ilin yaxud mövsümün müəyyən çağı. *İstədiyin vaxtda gələ bilərsən...*

6. Mövsüm. Ov vaxtı, Ağac əkmək vaxtı, Xırman vaxtı.

7. Əlverişli, münasib zaman; fürsət. ...

8. Boş saat, işdən azad zaman. *Gəlməyə vaxtım yox-dur...*

9. Möhlət. Borcu qaytarmaq üçün vaxt vermək

10. Nida mənasında: *vaxtdır – vaxtı çatmışdır. Vaxtdır evə getmək lazımdır...*»[1].

Eyni izahata üçcildlik izahlı lüğətdə də rast gəlirik[2].

Azərbaycan dilinin bircildlik izahlı lüğətində "vaxt" sözünə verilən izahat:

VAXT – is 1. zaman, 2. müddət, 3. zəmanə, dövr, 4. fəsil, mövsüm[3].

Göründüyü kimi, Azərbaycan dilinin dördcildlik və üçcildlik izahlı lüğətlərində "zaman" sözünün 3 mənası

---

[1] Azərbaycan dilinin izahlı lüğəti. I cild (red.: prof. Ə.Orucov), Bakı, Azərb. SSR EA nəşriyyatı, 1966, s. 351.

[2] Azərbaycan dilinin izahlı lüğəti. I cild, Bakı, «Çıraq», 1997, s. 184.

[3] Axundov A. Azərbaycan dilinin izahlı lüğəti. Bircildlik. Bakı, 2005, s. 425.

(onların ikisi terminoloji mənadır ) və 2 məna çaları, “vaxt” sözünün isə 10 mənası və 1 məna çaları qeydə alınmışdır. Azərbaycan dilinin bircildlik izahlı lüğətində isə “zaman” sözünün 3 mənası, “vaxt” sözünün 4 mənası qeydə alınmışdır.

İlk öncə qeyd edək ki, “zaman” və “vaxt” sözləri birinci mənada bütün lüğətlərdə biri digəri ilə izah edilir.

Lüğət məqaləsində “zaman” sözü birinci mənada “vaxt, müddət” olaraq təqdim edilir. “Vaxt” sözü üçün lüğətdə, yuxarıda gördüyümüz kimi, on məna verilmişdir. “Zaman” sözünün bu mənaların hansında işləndiyi göstərilmir. Qeyd edək ki, “vaxt, müddət” izahatı, yəni sözlərin arasında vergül işarəsinin qoyulması, lüğətdən istifadə qaydalarına görə[1], hər iki sözün eyni məna yükünə aid olduğunu bildirdiyi üçün “müddət” mənasına uyğun gəlir. Belə nəticə çıxarmaq olar ki, zaman “vaxt”dır, “müddət”dir. Hər iki cəhətdən qeyri-müəyyənlik yenə göz önündədir. Bundan əlavə, “zaman” sözünün bu mənasının illüstrasiyası üçün verilən nümunələrin hamısı özünü doğrultmur. 1-4-cü nümunələrdə (yuxarıda lüğət məqaləsində verilən izahata bax) işlənən “zaman” sözünün “vaxt, müddət” mənası daşıdığı ilə razılaşsaq da, bunu 5-ci nümunə üçün ((Beyrək) z*amanın yetişdiyini görüb yumruğunu masaya çırpdı.* M. Rzaquluzadə) demək olmaz. Bu nümunədə *zaman* sözünün “moment, an” mənasında işləndiyi aşkar görünür. Təsadüfi deyildir ki, həmin nümunədən dərhal sonra *zaman* sözünün adətən fellərdən sonra işləndiyi məqamda “bir hadisənin, işin baş verdiyi və ya baş vermiş olduğu vaxtı, anı bildirir.” izahatı verilir və bu, məna çaları ki-

---

[1] Bax: Azərbaycan dilinin izahlı lüğəti. I cild (red.: prof. Ə.Orucov), Bakı, Azərb. SSR EA nəşriyyatı, 1966.

mi qeyd olunur. Amma belə məna çaları *vaxt* sözü üçün ayrıca – 3-cü məna kimi qeydə alınır[1].

Qeyd edək ki, "zaman" sözünün birinci mənası üçün qeydə alınan "zəmanə, dövr, vaxt" kimi məna çaları da "vaxt" sözünün ayrıca – 4-cü mənası olaraq "dövr, zəmanə, çağ" şəklində göstərilir[2].

"Vaxt" sözü üçün qeydə alınmış "5. Günün, ayın, ilin yaxud mövsümün müəyyən çağı", "6. Mövsüm. ...", "7. Əlverişli, münasib zaman; fürsət. ...", "8. Boş saat, işdən azad zaman." mənaları "zaman" sözü üçün də keçərli olduğuna baxmayaraq, bu mənalar lüğətlərdə qeydə alınmamışdır.

*Zaman* sözünün göstərilən mənalarda, eləcə də digər mənalarda işləndiyini əyani şəkildə görmək üçün bədii ədəbiyyatdan topladığımız aşağıdakı nümunələrə diqqət yetirək.

1. ***Zamanı*** *anına qədər, kütləsi milliqramına qədər səmavi bir dəqiqliyə tabe olan bu dünyada balaca insan ömrü ümumi nizamdan kənarda qala bilməz.* (S. Rüstəmxanlı). 2. *Sadıq müəllimin yuxusuna haram qatan Yalanın da yeri ordadı... ancaq deyəsən orda da onu qəbul eləmək istəmirlər, bilirəm, məsələ çox qəlizdi,* ***zaman*** *göstərər...* (S.Səxavət). 3. *Ədəbiyyat tarixin hakimidir deyirlər; lakin yaşananlar tarixə çevrilmədən,* ***zamanın*** *güzəştsiz incələməsindən keçmədən hakimlik etmək ədalət baxımından riskli bir işdir* (S. Rüstəmxanlı). 4. *O vaxt Sadıq Murtuzayevə dost və tost deyənlər lap çox idi****;*** ***Zaman*** *da, Sadıq müəllim də öz işini gördü...* (S.Səxavət). 5. ***Zaman*** *heç bir mahiyyəti olmayan anlayışa*

---

[1] Azərbaycan dilinin izahlı lüğəti. I cild (red.: prof. Ə.Orucov), Bakı, Azərb. SSR EA nəşriyyatı, 1966, s. 351.

[2] Yenə orada, s. 351.

*çevrilib* (S.Əhmədli). 6. *Həmin adaların bəziləri **zaman** keçdikcə böyümüşdü* (İ.Şıxlı). 7. ***Zaman** keçdikcə gün, ay, hətta il unudulur, beyində bircə o ilişib qalırdı: onun doğulub, boya-başa çatdığı yurd ermənilərin əlindədir. Bu, nağıl, uydurma deyil, acı həqiqət, gerçəkdir* (S.Əhmədli). 8. *Əslində adamlar da **zaman** kimi dörd cür olur: Yaz adam, Yay adam, Payız adam, Qış adam...* (S.Səxavət). 9. ***Taxıl biçini zamanı** isə başqa kəndlilərlə birlikdə arvad-uşağını da yığıb, aran yerlərinə enərdi* (İ.Şıxlı). 10. *Müştərinin gələn **zamanıdır,** dükanın qabağın kəsməyiniz!* (M.F. Axundov). 11. *Sadıq müəllim uşaq qədər sadədi və ömrü boyu, həmişə, hər yerdə öz növbəsini, öz **zamanını** gözləyib, çoxları kimi heç vaxt özünü irəli dürtməyib, gözə soxmayıb* (S.Səxavət). 12. *Tapşırıram sənə butam Sənəmi, Gedirəm qürbətdə gəzəm **bir zaman*** (“Aşıq Qərib”dastanı). 13. *O vaxt **zaman,** dövr bax, bunu diktə eliyirdi (S.Səxavət).* 14. *“Rəsuli-xuda” zamanında belə şeylər olmayıb, “Qurani-Kərim”də də yoxdur” deyirdi* (Ə.Cəfərzadə). 15. ***Zaman** keçdi, illər dolandı, həmin adamlar öncə çox ustalıqla və sürətlə “hərəkatçı” olduqlarını bəyan elədilər* (S. Rüstəmxanlı).

Diqqət yetirildikdə, *zaman* sözünün 1, 2, 3, 4 və 5-ci nümunələrdə *vaxt* üçün qeydə alınmış “cərəyan edən bir işin, hadisənin və s.-nin əsrlər, illər, saatlar, dəqiqələr, saniyələrlə ölçülən davam müddəti”, 6, 7 və 15-ci nümunələrdə “saatların, günlərin, illərin ardıcıl surətdə bir-birini əvəz etməsi” mənasında, 8-ci nümunədə “mövsüm, fəsil”, 9 və 10-cu nümunələrdə “günün, ayın, ilin yaxud mövsümün müəyyən çağı”, 11-ci nümunədə “əlverişli, münasib zaman; fürsət”, 12-ci nümunədə “müddət”, 13 və 14-cü nümunələrdə isə “zəmanə, dövr” mənasında və ya onlara yaxın mənada

işləndiyini hiss etmək olur. Amma bu mənaların çoxu *zaman* sözü üçün lüğətlərdə qeydə alınmamışdır.

*Zaman* və *vaxt* sözlərinin leksik mənalarının izahında onları eyni semantik qrupda birləşdirən ümumi komponentlərdən ibarət söz və söz birləşmələrinin də nəzərə alınması vacibdir. Həmin sözlərin oxşar sintaktik konstruksiyalarda bir-birini əvəzləyə bilməsini də bədii ədəbiyyat nümunələri əsasında görmək olar. Bunu göstərən misallara diqqət yetirək:

***O vaxtlar*** *həkim deyənə şübhə ilə baxırdılar ki, havalanıb – həkim nə gəzirdi* (S.Səxavət). *Xəzərin* ***o zaman*** *hələ neft qarışmamış, zir-zibilə, çirkaba bulaşmamış mavi sularına o qədər göz yaşı töküldü ki!..* (Ə.Cəfərzadə). ***O vaxt*** *buna etiraz edənlər olub, cavabında Amili gör nə söyləyib; deyib ki, mən demirəm ki, o alicənab insan peyğəmbərdir; amma neynəyəsən ki, kitabı var..* (Ə.Cəfərzadə). *Fürsət* ***hər zaman*** *ələ düşməz* (Atalar sözü). *Belə* ***ağır zamanda*** *Moskvaya belə inanmaqla neyləyəcək bu yazıq* (S.Rüstəmxanlı). *Qırx il qürbətdə yaşayan Nəsir müəllimin ürəyində öz kəndinin camaatına birdən-birə bir qəribə - o çağacan* ***heç vaxt*** *hiss eləmədiyi - mehr-məhəbbət oyanmışdı* (Ə.Əylisli). *Əlifağa həmişə* ***belə vaxtlarda*** *olduğu kimi, birdən yekə mikrofonu Noradan aldı və...* (Elçin). *Yaxın* ***zamanlarda*** *isə yeni avadanlıqların alınaraq istismara yönəldiləcəyini vurğulayan komitə sədri gələcəkdə əlaqələrin daha da genişlənəcəyini vurğulamışdır.* ("Azərbaycan" qəzeti). ***Yaxın vaxtlarda*** *5 yeni sahil mühafizəsi məntəqəsi istifadəyə veriləcəkdir* ("Azərbaycan" qəzeti). *Cevizin hər budağı qopub şaqqıltı ilə yerə düşəndə qoca "esse" deyib, toy qaydası sevinclə çəpik çalırdı və onun üz-gözünün nuru* ***bu zaman*** *daha da çoxalırdı* (Ə.Əylisli). ***Bu zaman*** *şəhər çılpaq, adamsız, hərəkətsizdir,*

*yalxıdır, bəzək-düzəksizdir, səssiz-səmirsiz, danışıqsız, neon reklamsızdır* (Anar). *Halbuki o, qardaşının balalarına qarşı **hər vaxt** diqqətli olmaq, onları qarşılıqlı məhəbbətlə əziz-ləyib, ürəyində qövr eləyən köhnə bir yaranın ağrısını unutmaq istəyirdi* (İ.Hüseynov). *Cavanlıqdı də, adam gücünə, zoruna arxayın olub **vaxtı** vecinə almır* (S.Səxavət). ***Zaman** gəlməlidi, bizim olmalıdı bu torpaqlar, bəsdi.» Həmşəri kö-çürmə hadisələri baş verməmiş qızın, Əminənin atasını, qar-daşlarını, nəslinin kişi qismini şəhərdən itirtdirəndə yalnız bu xəyallarla yaşayırdı Qriqoryan* (Ə.Cəfərzadə). *... **bir vaxtlar** əlimi öpməyə hazır idin, sən də, elə hamınız...* (S.Səxavət). *Yerdə oturub, kürəyini qovağın gövdəsinə söykəyib, **çox zaman** gözlərini yumub, simləri az qala birər-birər dinləyirdi, asta-asta, narın-narın, həzin-həzin çalırdı* (İ.Hüseynov). ***Belə vaxtlarda** o, əl saxlayıb, kənddə eşidilməsi mümkün olan bütün səslərə diqqətlə qulaq asırdı və zənninin aldandığı hər dəfə bir yeni ləzzətlə yəqin eləyib, sevinə-sevinə işə girişirdi* (Ə.Əylisli).

Göstərilən nümunələrdə işlənən *zaman* və *vaxt* sözləri-ni konstruksiya daxilində bir-biri ilə əvəzləmək olur və bununla heç bir məna dəyişikliyi olmur. Bəzən bir yazıçı və ya şairin işlətdiyi eyni konstruksiya daxilində hər iki sözün işləndiyi müşahidə edilir. Məsələn:

***Zaman keçdikcə**, Vəli müəllimin və yanımdakı dostla-rımın sözünü sındırmayıb atdığım bu addımın gərəkliliyini və xeyrini daha aydın başa düşürəm* (S.Rüstəmxanlı. Xətai Yurdu).

***Vaxt keçdikcə**, baxçanın bəyazlığı zirvələrin qarına qarışdı və dünyanın harasından baxdımsa, doğma dağlarımı-*

*zı, böyüdüyüm rayonu o ağ güllərin rəngində gördüm* (S.Rüstəmxanlı. Xətai Yurdu).

*Və çörək muzeyi dünyəvi – ümumbəşəri bir ziyarətgaha çevrilməlidi; iyirmi birinci əsrin əvvəllərində, ölkələrin bir-birinin üstünə yeriyib qan tökdüyü, bir-birini xarabazara çevirdiyi, yer üzündəki adamların böyük bir hissəsinin acından öldüyü, bəşəriyyətin yarısının sözünün ikinci yarısının boğazından keçmədiyi* ***bir vaxtda****, orta əsrlər şüuru və təfəkkürü ilə yaşadığı* ***bir zamand****a yer üzündə yaşayan əhalinin belə vahid bir məbəddə birləşməyi nə qədər yerinə düşər və arxa-arxaya verib Yer kürəsini fəlakətdən qoruyardılar* (S.Səxavət).

Bütün bunlar Azərbaycan dilinin izahlı lüğətlərində *zaman* sözü üçün verilən izahatın kafi olmadığını göstərir.

"Zaman" sözünün qeydə alınmayan, amma qeydə alınması lazım olan və yuxarıda nəzərdən keçirdiyimiz mənaların təhlili göstərir ki, *zaman*, ilk növbədə, ümumfəlsəfi anlayış kateqoriyasının adıdır. Lüğətlərimizdə bunun izahı "2. Fəlsəfədə: sonsuz inkişaf edən materiyanın, vaxtın davamı və ardıcıllığında təzahür edən ümumi obyektiv varlıq forması." kimi verilir. Göründüyü kimi, ümumfəlsəfi anlayış kateqoriyası ilə "zaman" sözünün leksik mənası eyniləşdirilir. Verilən izahatda "vaxtın davamı və ardıcıllığında təzahür edən" təyini məntiqi və məzmun baxımından anlamsız söz yığınıdır. Doğrudur, zaman materiyanın varlıq formasıdır, amma, izahata görə, həmin varlıq forması, yəni zaman "vaxtın davamı və ardıcıllığında" təzahür edir. Dolaşıq deyilmi?

Yuxarıda göstərilmiş nümunələrin bir neçəsində "zaman"ın məişət anlayışı səviyyəsində təzahürü müşahidə olunur. Məişət anlayışı səviyyəsində "zaman" ədəbi dilə daxil

